Azərbaycan Respublikası
Bakı İslam Universiteti
Zaqatala Şöbəsi

*Kitabın adı:*
İslam Əqaidi və Kəlam Elminə Giriş

*Müəllif:*
Heyət

*Məsləhətçi:*
B.İ.U Zaqatala Şöbəsinin Müdiri İbrahim İbrahimov

*Bədii Redaktor:*
Samir Kərimov

*Dizayn:*
Ülvi Məmmədov

Bu Kitab Bakı İslam Universiteti Zaqatala Şöbəsinin 07 fevral 2007-ci il tarixli Pedoqoji Şurasının IV iclasının 5 saylı qərarı ilə çap edilmişdir.

Ünvan: Zaqatala Şəh. Heydər Əliyev pros. No:88

İndex: 6200

Tel: (+994) 174 53 246

Faks: (+994) 174 52 183

e-mail:  zakatalailahiyat@gmail.com

ISBN: 978-9952-8111-2-4

Ders Kitabları - 05

Bakı 2007

## MÜNDƏRİCAT

GİRİŞ ........ 13
I.DİN ........ 15
A. Dinin tərifi ........ 15
B. İnsanda din duyğusu və dinə olan ehtiyac ........ 16
C. İslam əqaidinin xüsusiyyətləri........ 17
II. İMANIN TƏRİFİ VƏ MAHİYYƏTİ ........ 19
A. İmanın tərifi........ 19
B. İmanın mahiyyəti ........ 20
III. ƏHLİ SÜNNƏ KƏLAM ALİMLƏRİNƏ GÖRƏ İMAN-ƏMƏL MÜNASİBƏTİ ........ 21
A. Əməl, imandan bir hissədirmi? ........ 21
B. Əməlin vacibliyi ........ 21
C. Təqlidi iman- istidlali iman ........ 22
D. İmanın səhih olmasının şərtləri ........ 23
E. Böyük günah-Kiçik günah........ 24

## I FƏSİL

ALLAHA İMAN ........ 27
I. İMANIN VACİBLİYİ ........ 29
A. Allaha inanmanın vacibliyi ........ 29
B. Allahın varlığının dəlilləri........ 29
II. İNKAR PROBLEMİ VƏ İNKAR EDƏN QRUPLAR ........ 32
A. İnkar problemi........ 32
B. İnkar edən qruplar ........ 34
1. Materializm ........ 34
2. Darvinizm........ 35

3. Pozitivizm........................................................................ 36
4. Freudizm.......................................................................... 37
III. ALLAHIN VARLIĞINI İSBAT EDƏN DƏLİLLƏR ................................39
A. Mövzunun xüsusiyyəti .................................................................. 39
B. Allahın varlığına dair dəlillər ........................................................ 40
1. Fitrət (təbii) dəlili ........................................................................ 40
2. Yaradılmışlıq dəlili ...................................................................... 40
3. Nizam dəlili ................................................................................ 41
4. Əsrimizdə Allahın varlığına dair ortaya atılan dəlillər ................ 42
IV. ALLAHIN BİRLİYİ ........................................................................ 44
A. İmanda tövhid ............................................................................. 44
1. Allahın zatında tövhid .................................................................. 44
2. Allahın sifətlərində tövhid ............................................................ 46
3. Allahın feillərində tövhid .............................................................. 47
4. İbadətdə tövhid ........................................................................... 47
B. Şirk və Şirkin növləri ....................................................................49
1. Böyük şirk .................................................................................. 50
2. Yaradılanlara yüksək hörmət ...................................................... 50
a. Şəxslərə həddindən artıq hörmət ................................................ 50
b. Təbiəti ucaltmaq ......................................................................... 52
3. Qeybin bilinməsi ......................................................................... 53
4. Günahsızlıq-Şəfaət ..................................................................... 54
5. Riya və Mənfəət .......................................................................... 56
V. ALLAHIN SİFƏTLƏRİ ................................................................... 57
A. Zat və Sifət ................................................................................. 57
B. İlahi sifətlər ................................................................................. 58
1. Səlbi Sifətlər ............................................................................... 58
2. Sübuti Sifətlər ............................................................................ 59
3. Feli Sifətləri ................................................................................ 61
C. Əsmaül-hüsna ............................................................................. 62
D. Allahın röyada görülməsi (RUYƏTULLAH) .................................. 66

## II FƏSİL

QƏDƏR VƏ QƏZA ........ 69
A. QƏDƏR VƏ QƏZAYA İMAN ........ 71
B. İNSAN İRADƏSİ VƏ BUNUN FEİLDƏKİ ROLU ........ 72
C. İNSANIN FEİLLƏRİ VƏ QƏDƏR ........ 72

## III FƏSİL

PEYĞƏMBƏRLƏRƏ İMAN ........ 75
I. PEYĞƏMBƏRLƏRƏ İMAN ........ 77
II. PEYĞƏMBƏRLİKLƏ ƏLAQƏLİ OLAN MƏFHUMLAR ........ 78
A. NÜBÜVVƏT ........ 78
B. VƏHY ........ 78
1. Vəhyin Tərifi ........ 78
2. Vəhyin Növləri ........ 79
III. İNSANLARIN PEYĞƏMBƏRLƏRƏ OLAN EHTİYACI ........ 79
IV. PEYĞƏMBƏRLİYİN SÜBUTU ........ 80
A. Möcüzələr ........ 81
B. Fövqəladə Hadisələr ........ 82
V. PEYĞƏMBƏRLƏRİN SAYI VƏ QURANDA ADI KEÇƏN PEYĞƏMBƏRLƏR ........ 82
VI. PEYĞƏMBƏRLƏRİN XÜSUSİYYƏTLƏRİ ........ 83
VII. PEYĞƏMBƏRLƏRİN DƏRƏCƏLƏRİ ........ 85
VIII. AXIRINCI PEYĞƏMBƏR HZ. MƏHƏMMƏD (S.Ə.V) ........ 86
IX HZ. PEYĞƏMBƏRİN PEYĞƏMBƏRLİYİNƏ İMAN ........ 88
X. NÜBÜVVƏTİN BEYNƏLMİLƏL OLMASI ........ 88
XI. NÜBÜVVƏTİN DƏLİLLƏRİ ........ 89
A. Qurani Kərim ........ 89
B. Hz. Peyğəmbərin keçmiş ilahi kitablarda müjdələnməsi ........ 92
C. Hz Peyğəmbərin uca əxlaqı ........ 93
D. Hz Peyğəmbərin möcüzələri ........ 93
XII. HZ.MƏHƏMMƏDİN AXIRINCI PEYĞƏMBƏR OLMASI ........ 94

## IV FƏSİL

KİTABLARA İMAN ....97
I. KİTABLARA İMAN .... 99
II. MÜQƏDDƏS KİTABLAR .... 99
A. Sühüf (Səhifələr) ....99
B. Tövrat .... 100
C. Zəbur....101
D. İncil.... 101
E. Qurani Kərim ....102
III. ƏVVƏLKi MÜQƏDDƏS KİTABLARIN POZULMASININ SƏBƏBLƏRİ VƏ POZULDUĞUNUN DƏLİLLƏRİ .... 103
A. Müqəddəs Kitabların Pozulmasının səbəbləri....103
B. Müqəddəs Kitabların Pozulduğunun Dəlilləri .... 104

## V FƏSİL

MƏLƏKLƏRƏ İMAN.... 107
I. MƏLƏKLƏRƏ İMAN....109
A. Mələklərin Mahiyyəti.... 109
B.Mələklərin vəzifələri.... 110
C. Mələklərin sayı və növləri....112
II. ŞEYTAN VƏ CİN ....114
A. Şeytan .... 114
B. Cin .... 115

## VI FƏSİL

AXİRƏT GÜNÜ VƏ AXİRƏTƏ İMAN.... 117
I. AXİRƏT GÜNÜ VƏ AXİRƏTƏ İMAN .... 119
II. AXİRƏT HƏYATI.... 121
A. Qəbir Həyatı .... 121
B. Qiyamət və qiyamət əlamətləri ....122
C. Qiyamətin Qopması (surun üfürülməsi) .... 127
D. Bəs (yenidən dirilmək).... 128

E. Həşr ... 129
F. Əməl dəftəri ... 129
G. Hesab və Mizan ... 130
H. Şəfaət və Kövsər hovuzu ... 131
X. Sirat ... 132
III. HESABDAN SONRAKI HƏYAT ... 133
A. Cənnət ... 133
B. Əraf ... 135
C. Cəhənnəm ... 136

**VII FƏSİL**

KƏLAM ELMİ ... 137
I. KƏLAM (ƏQAİD) ELMİ ... 139
A. ƏQAİD ... 139
B. KƏLAM ELMİ ... 139
1. Tərifi ... 139
a. Mövzusuna görə tərifi ... 139
b. Qayəsinə görə tərifi ... 140
2. Kəlam elminin məqsədi ... 141
II. KƏLAM ELMİNİN TARİXİ VƏ ONDAN BƏHS EDƏN ƏSƏRLƏRİ ... 141
A. Əsri-Səadətdəki vəziyyət ... 141
B. Etiqadi problemlərin meydana gəlməsinin səbəbləri və ilk ixtilaflar ... 142
C. Kəlam elminin meydana çıxması və mötəzilə elmi-kəlamı ... 144
D. Əhli-sünnə kəlamçıları ... 144
E. Kəlam-fəlsəfə münasibətləri ... 146
F. Mütəəxxirin elmi-kəlamı ... 146
1.Qəzzali və onun kəlam elmindəki yeri ... 146
2. Fəlsəfə ilə qarışdırılmış kəlam dövrü ... 148
3. Şərh və incələmə dövrü ... 148
G. Yeni kəlam elmi dövrü ... 149
III. ETİQADİ MƏZHƏBLƏR ... 149

A. Sələfiyyə ........ 150
B. Matürudiyyə ........ 151
C. Əşariyyə ........ 152
D. Mötəzilə ........ 153
E. Şiə ........ 154
1. Keysaniyyə ........ 155
2. Zeydiyyə ........ 155
3. İmamiyyə ........ 155
4. Ğaliyyə ........ 155
5. Batiniyyə ........ 156
F. Xariciyyə ........ 156
G. Mürciə ........ 157
H. Müşəbbihə və Mücəssimə ........ 157
X. Cəbriyyə ........ 157
IV. KƏLAM TERMİNİ OLARAQ BİDƏT ........ 158
V. HÖKMLƏR, METODLAR ........ 158
A. HÖKMLƏR ........ 158
1. Dini Hökmlər ........ 158
a. Etiqadi hökmlər ........ 159
b. Əməli hökmlər ........ 159
c. Əxlaqi hökmlər ........ 160
d. Dini hökmlərin etiqadi yönü ........ 160
2. Ağıl ilə verilən hökmlər ........ 161
B. METODLAR ........ 161
1. Sələfiyyə ........ 161
2. Kəlamçılar ........ 162
a. Sağlam duyğu orqanları ........ 162
b. Doğru xəbər ........ 162
c. Ağıl ........ 163
3. Sufiyyə ........ 163
4. Fəlsəfəçilər ........ 164

## ÖN SÖZ

İslamın, din kimi ortaya çıxışı ilə bərabər onun əhatə etdiyi mövzuları hədsiz tədqiqatların obyekti olmuşdur. Məhz, bu tədqiqatlar İslamın ilk dövrlərindən etibarən həyatın müxtəlif sahələrində baş vermiş dini, elmi, mədəni və s. dəyişiklikləri təfərrüatlı olaraq ortaya çıxarmışdır. Belə ki, İslami elmlərin tədricən ortaya çıxışı ona duyulan ehtiyacın nəticəsi ilə olmuşdur. Bundan on üç əsr əvvəl müsəlmanların başlatdığı müxtəlif fikri cərəyanlar İslami elmlərin təşəkkül tapmasına müəyyən qədər öz təsirini göstərmişdir.

Sonuncu İlahi dini bütövlükdə ələ alaraq digər din, inanc, tələqqi və düşüncələr qarşısında öz mövqeyini bildirən elm, Əqaid və Kəlam elmidir. On üç əsr öncə İslam tarixində ilk olaraq meydana çıxan bu elm, son ilahi dinə qarşı səmimi duyğular mənimsəyən insanları irşad etmək, zidd düşüncəyə malik olan insanları da susduraraq dinə verəcəkləri zərəri minumum səviyyəyə endirmək məqsədi daşıyırdı.

İslam dini ümumiyyətlə dünya dinləri və dini ideologiya baxımından hər zaman ön plandadir. Dünya nüfusunun dörddə birini meydana gətirən müsəlmanlar başlanğıcda olduğu kimi yenə də irşad edilməyə möhtacdır. Bu baxımdan Azərbaycanımızdakı İslami elmlər və bu elmlərin dərs vəsaitinə olan ehtiyacı da hiss olunmaqdadır.

Bu ehtiyacı diqqətə alaraq, İslami elmlərin ən lüzumlusu olan Əqaid və Kəlam elminin tarixi təşəkkülü və İslamın iman əsasları mövzusu haqqında məlumat vermək məqsədilə bu əsəri qələmə aldıq. Kitab, giriş və yeddi bölmədən ibarətdir. İlk altı bölmədə İslam dininin inanc əsasları, yeddinci bölmədə isə İslam düşüncəsinin fundamental sahələrindən biri olan Kəlam elmi ilə əlaqəli mövzular öz əksini tapmışdır.

Əsərin meydana çıxması və çap edilməsində hər cür köməkliyi göstərən Gəncliyə Yardım Fonduna, eyni zamanda bu əsərin ərsəyə

gəlməsində maddi və mənəvi köməyini bizdən əsirgəməyən Bakı İslam Universiteti Zaqatala şöbəsi rəhbərliyinə, əsəri Azərbaycan dilinə tərcümə edən Samir Kərimova öz təşəkkürümü borc bilirəm. Bu əsərin nəzərdə tutulan hədəfi istiqamətində istifadə edilməsini Uca Allahdan arzu edirəm.

**Sedat Demir**

**Zaqatala-2007**

# I. DİN

## A. Dinin tərifi

Din müxtəlif şəkillərdə tərif edilmişdir. Dinin tərifini izah etməyə çalışanlar dinlər tarixi, sosiologiya və psixologiya alimləri ilə filosoflardır. Bunlar tarix boyunca dinə qarşı bəslədikləri fikir və düşüncə sistemlərini nəzərə alaraq din məfhumunu izah etməyə çalışsalar da, bir-birinin tənqidinə məruz qalmışdırlar.

Lüğətdə üsul, adət, tutulan yol, hökm, cəza, itaət mənasına gələn din, Allah Təala tərəfindən göndərilən, insanların dünyadakı həyat tərzini nizamlayaraq həm dünyada, həm də axirətdə səadətə qovuşduran, Allaha necə ibadət edəcəyimizi bildirən, ağıllı insanların öz iradələriylə xeyirli və gözəl işlər etməsinə sövq edən və peyğəmbər vasitəsiylə insanlara çatdırılan ilahi qanuna deyilir. Bu din tərifində diqqəti cəlb edən bəzi xüsusiyyətlər vardır.

a) Din, insanlara Allah (c.c) tərəfindən göndərilir. Ondan başqa heç kimin nə din göndərməyə, nə də dini hökmləri dəyişdirməyə hüququ vardır. Peyğəmbərlər belə, özlərindən nə yeni bir din gətirər, nə də öz başına dinə bir əlavə edərlər. Sadəcə Allahdan aldıqları əmr və qadağaları ümmətlərinə çatdırarlar. Peyğəmbərlərə “din gətirən” ləqəbinin verilməsi məcazi məna ifadə edir.

b) Din, insana yaradılışındakı hikmət və məqsədi xatırladaraq yaradana və digər məxluqlara qarşı vəzifələrini bildirir. İnsan boşuna yaradılmamışdır. İnsanın yaradılışındakı məqsəd və hikmət bir ayədə belə izah edilir: **“Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım.”**[1]

---

1. əz-Zariyat 51/56.

c) Din, insanlara hidayət və səadət yollarını göstərərək onları, xeyirli, yaxşı və gözəl işlər görməyə sövq edir. Bunun nəticəsi olaraq insanlara dünyada nizam və intizamlı bir həyat tərzi verməklə bərabər, axirətdə də onların məsud olmalarını təmin edir.

d) Din, peyğəmbərlər vasitəsilə insanlara çatdırılan əmr və qadağalardan meydana gələn ilahi bir qanun və nizam-intizam olduğuna görə qaynağı vəhydir.

Qaynağı vəhy olmayan, insanlar tərəfindən ortaya atılan, dəyişdirilmiş və ya pozulmuş, insanları həm bu dünyada, həm də axirətdə səadət və hüzura çatdırmayan dinlər, İslama görə həqiqi din hesab edilmir.

**B. İnsanda din duyğusu və dinə olan ehtiyac**

İnsanda din duyğusu anadan gəlmədir. Sonradan əldə edilən bir şey deyildir. Çünki, hər insanda bir böyük varlığa yönəlmə və ona ibadət etmə meyli vardır. Bu meyil insana doğuşdan verilmişdir. Tarix boyunca insanlar heç vaxt din düşüncəsindən uzaq qalmamış, istər haqq istərsə də batil olsun bir dinə inanmış və o dinə qulluq etmişdirlər.

Peyğəmbər Əfəndimiz də bir hədisində *"Hər doğulan bir fitrət üzrə (din düşüncəsi ilə) doğular. Ancaq o uşağın anası və ya atası onu öz dinlərinə yönləndirərlər. Yəhudi isə yəhudi, xristian və ya məcusi isə xristian va ya məcusi olaraq yetişdirərlər."*[2]-deyə buyuraraq din düşüncəsinin doğuşdan insanda var olduğunu xəbər vermişdir. Bəzi dinlər tarixi və sosiologiya tədqiqatçıları dinin insan ruhunda anadan gəlmə bir xüsusiyyət olduğunu kəşf etmişlər, ancaq insanlar bütün dövrlərdə eyni şeylərə inanaraq onlara bağlanmamış, vaxt aşırı dinlərindən dönmüşdürlər. Bu cür hallarda belə, insanlar uca bir varlığa inanmış, ona ibadət etməyə yönəlmişdirlər. Beləcə səhv də olsa bir dinə bağlanma insanda yaradılışdan gələn bir din düşüncəsinin varlığını ortaya qoymuşdur. Odur ki,

a) Din duyğusu anadan gəlmə hər insanda var olduğuna görə, bu duyğunun tətmin edilməsi, insan ruhunun hüzur və səadət tapması üçün bir dinə ehtiyac hiss etməsinə əsas yaradır. Nə elm, nə mədəniyyət nə də hər hansı bir sənət insanın könlündəki mənəvi boşluğu doldura bilər.

2. Buxari, Cənaiz, 80

Doldursa belə, bu tətmin etmə müvəqqəti olar. İnsanda daimi tətmini ancaq din təmin edər.

b) İnsan, bədən və ruhdan meydana gəlmişdir. Bədən və ruh ətlə sümük kimidir. Necə ki, bədənin yemək, içmək, oturmaq, qalxmaq kimi maddi ehtiyacları olduğu kimi ruhun da özünə aid bəzi ehtiyacları vardır. Ruhun ən böyük ehtiyacı  dindir. Din, ruhu müxtəlif zərərlərdən mühafizə edir. Ruhun ehtiyacı din ilə təmin edilməzsə həm fərddə, həm də cəmiyyətdə müalicə edilməsi çətin olan yaralar meydana gələr.

c) İnsan düşünməyə başladığı andan etibarən "Hardan gəldim? Haraya gedirəm? Öləndən sonra nə olacam? Məni kim yaratdı? Məni nə üçün yaratdı? Məni yaradan uca varlığın xüsusiyyətləri nələrdir? Bu dünyadan başqa aləm varmı.....?" kimi bəzi sualların cavabını axtarır. İnsan çox vaxt bu sualları ağlı ilə cavablandıra bilmir. Bəzən də, bu mövzularda düşündüyü fikirlər aldadıcı ola bilər. Bu zaman din, o insanın köməyinə çatar, bu və ya digər sualları cavablandırarkən düşdüyü çarəsizlikdən onu xilas edər.

### C. İslam əqaidinin xüsusiyyətləri

Hz Adəmdən bəri bütün peyğəmbərlərin təbliğ etdiyi tövhid inancını yaşadan yeganə əqidə olan İslam əqidəsinin xüsusiyyətlərini belə sıralamaq olar.

a) İslam əqaidi açıq-aydındır.

İslam əqaidini bu cümlələrlə xülasə etmək mümkündir: Son dərəcə gözəl, nizam-intizamlı və sağlam olan bu aləmin xaricində onu yaradan və nizamlayan bir ilahi varlıq vardır. Bu ilah hər şeyi bir ölçü əsasında yaradmışdır. Onun şəriki, oxşarı, bərabəri və oğlu yoxdur. "**Bəli, göylərdə və yerdə nə varsa, hamısı Ona məxsusdur, hamısı Onun itaətindədir!"**[3]

İslam tövhid əqidəsində dualizm, üçlük və buna bənzər digər inanc sistemlərində olan ziddiyətlər yoxdur.

b) İslam əqaidi sabit və dəyişməyən bir əqidədir.

İslam əqaidi artma və azalmağı, təhrif və dəyişdirilməyi qəbul etməyən sabit bir əqidədir. Hər hansı bir din adamı, elmi şuranın və ya din şurasının

3. əl-Bəqərə, 2, 116.

–xristianlıqda olduğu kimi– onda olmayan şeyləri ona əlavə etməsi, onda olanı əksiltməsi mümkin deyildir. Hz. Peyğəmbərin də buyurduğu kimi, İslam əqaidinə əlavə ediləcək və ya ondan çıxardılıcaq hər şey rədd edilmişdir: *"Kim haqqımızda olmayan bir şeyi uydurarsa rədd edilmişdir"*. İslam bunların heç birini qəbul etməz.

c) İslam əqaidi qəti dəlillərə etimad edir. İslam əqaidi mücərrəd hökmlərdən bəhs etməklə kifayətlənməz, qəti dəlillərə etimad edər. Başqa inanc sistemlərində olan "Gözünü yum və mənə tabe ol", "Cəhalət təqvanın anasıdır" kimi düşüncələrin İslam əqaidində yeri yoxdur. Əksinə "**Əgər doğru deyirsinizsə, dəlillərinizi gətirin!"**[4] -deyə buyurur. Qurani-Kərim, Allahın varlığı, birliyi və kamal sifətləriylə sifətlənmiş olduğu mövzusunda kainatdan, insanın özündən və tarixdən dəlillər gətirir. İnsanın ilk yaradılışından, göyün və yerin yaradılışından, bahar fəslində təbiətin yenidən canlanmasından bəhs edərək öldükdən sonra dirilməyin mümkin olduğu nəticəsinə gəlir.

d) İslam əqaidi mutədil, ifrat və təfritdən uzaq bir inanc sistemidir.

1. İslam əqaidi hissiyat üzvləri ilə idrak edə bilmirik deyə maddi aləmin xaricində olanları inkar edənlərlə, birdən çox ilahi varlığı qəbul edib, ilahi varlığın ruhunu bəzi insanlara hətta heyvanlara və bəzi bitkilərə daxil olduğunu iddia edənlərin arasında yer alan doğru bir inanc sistemidir. İslam əqaidi şirkə düşən ilah düşüncəsindən uzaqlaşmaqla yanaşı inkarı da tərk etmişdir. Aləmin tək bir Allahı olduğunu, özündən başqa heç bir ilahın olmadığını ortaya qoymuşdur. **Ya Rəsulum bu müşriklərə de: "Əgər bilirsinizsə, bu yer və yer üzündə olanlar kimindir? Onlar mütləq: "Allahındır!"-deyə cavab verəcəklər. Sən də de: "Bəs elə isə (məxluqatı yaratmağa qadir olan kəsin öləndən sonra onları yenidən dirildə biləcəyini) düşünmürsünüz?"**[5]

2. İslam əqaidi Allahın sifətləri mövzusunda da orta yolu təqib etmişdir. Nə Yunan fəlsəfəsində olduğu kimi bəzi ilahi sifətləri inkar etmiş, nə də Yəhudilikdəki kimi Allahı yaradılanlara oxşatma və Allahı cism kimi qəbul etməyərək orta yolu təqib etmişdir. Qurani-Kərim, bir tərəfdən Allahı yaradılanlara bənzətməyi qadağan edərkən, digər tərəfdən onu kamal

4. əl-Bəqərə, 2, 111.
5. əl-Muminun 23, 84-85.

sifətləri ilə sifətləndirir: **"Ona bənzər heç bir şey yoxdur. O eşidəndir, görəndir"[6]**. Ayətül kürsidə bildirildiyi kimi: **"Allahdan başqa heç bir tanrı yoxdur. Əbədi, əzəli varlıq Odur. O nə mürgü, nə də yuxu bilər."** [7]

3. İslam əqaidi digər inanc sistemləri ilə olan münasibətdə də orta yolu tutmuşdur. **"Mənim əməlim mənə, sizin əməliniz isə sizə aiddir. Mənim etdiyim əməllərin sizə, sizin etdiyiniz əməllərin mənə heç bir dəxli yoxdur!"**[8] ayəsində də xüsusiylə səmavi din mənsublarına qarşı təəssüb göstərilməməsinin vacibliyindən bəhs edir. İslam, **"Allaha tərəf çağıran, yaxşı iş görən və: "Mən müsəlmanlardanam!"-deyən kəsdən daha gözəl danışan kim ola bilər?!"**[9] ayəsiylə, digər din mənsublarını İslama dəvət etməyə təşviq edərkən: **"Dində məcburiyyət yoxdur. Artıq doğruluq azğınlıqdan ayırd edildi."**[10]**-**deyə buyuraraq məcburiyyətə də razı olmadığını göstərmişdir.

4. İslam əqaidi peyğəmbərlər haqqında da orta bir yol təqib etmişdir. Peyğəmbərləri əsla ilah mərtəbisinə yüksəltmədiyi kimi, insanların ən aşağı dərəcəsinə də endirməmişdir.

## II. İMANIN TƏRİFİ VƏ MAHİYYƏTİ

### A. İmanın tərifi

Ərəb dilində (ə-m-n) kökündən ifal vəznində bir məsdər olan iman lüğətdə, bir insanın söylədiyi şeyi təsdiq etmək, ifadə etdiyini qəbul etmək, ürəkdən mənimsəmək, şübhə yaratmayacaq dərəcədə tam olaraq ürəkdən inanmaq mənasına gəlir.

Termin mənası isə, Hz. Peyğəmbərin (s.ə.v) Allah Təaladan gətirdiyi şübhəsiz olaraq bilinən hökmlərdə Onu təsdiq etmək, onun xəbər verdiyi şeyləri tərəddüd etmədən qəbul edib, bunların gerçək və doğru olduğuna könüldən inanmaq deməkdir. İslam aşkar və meydanda olan, iman

6. əş-Şura 42, 11.
7. əl-Bəqərə 2, 255.
8. Yunus 10, 41.
9. Fussilə 41, 33
10. əl-Bəqərə 2, 256.

isə qəlbdə olandır. Az əvvəl ifadə etdiyimiz kimi iman bir qəlb və könül məsələsidir. Altı əsas prinsipdən meydana gələn iman əsaslarını qavrayan ağıl, onların həqiqətə uyğunluğunu təsdiq edən də qəlbdir. Bu baxımdan iman dinin teorik yönünü təşkil edir. İslamın şərtləri isə, bir iş etməyə sövq edən namaz qılmaq, oruc tutmaq kimi xüsuslardır. Bu mövzular da İslamın əməli (praktiki) yönünü meydana gətirir.

### B. İmanın mahiyyəti

İslam alimləri kamil imanı belə tərif etmişlərdir. "İman, qəlb ilə təsdiq etmək, dil ilə söyləmək və bədən üzvləriylə əməl etməkdir". Ancaq islam alimlərinin bir çoxu imanı təhlil edərkən əslində onun təsdiqdən ibarət olduğu qənaətinə sahib olmuşdurlar. Bir insan İslamın bəxş etdiyi iman əsaslarını qəlbi ilə təsdiq etsə, o insan Allah dərgahında mömindir. Ancaq bunu dili ilə ifadə etməsə -ki bunun ən qısa ifadə tərzi kəliməyi tövhidi söyləməkdən ibarətdir- könlündə təsdiq etsə belə xalq arasında mömin olduğu bilinməz və müsəlman olaraq şübhə yaradar. Bədən üzvləriylə əməl etsə, yəni namaz qılsa, oruc tutsa alimlərimizə görə bunlar imanı təşkil edən ünsürlərdən deyil. Bu baxımdan iman əsaslarını qəlb ilə təsdiq etməklə yanaşı, Allahın əmr və qadağalarını həqiqi mənada dərk etməyən, ancaq əməldə əksiyi olan, ilahi əmrləri yerinə yetirməyən və qadağalardan uzaqlaşan insan yenə mömindir. Təbi ki, belə insanlar dinin praktiki hökmlərini yerinə yetirmədiyi, fərzlərdn uzaqlaşdığı və günahlardan qaçmadığı üçün günahkardır. Ancaq belə insanlar, əməl ilə bəslənmədiyi müddətcə, qalan imanını da ömürlərinin axırına qədər mühafizə etməmək təhlükəsiylə qarşı-qarşıyadır.

## III. ƏHLİ SÜNNƏ KƏLAM ALİMLƏRİNƏ GÖRƏ İMAN-ƏMƏL MÜNASİBƏTİ

### A. Əməl, imandan bir hissədirmi?

Maturidiyyə və Əşariyyə kəlamcılarına görə, əməl imandan bir hissə deyil. Qəlbi ilə təsdiq edib, imanını dili ilə ifadə edən, ancaq əməllərdən birini və ya bir neçəsini tərk edən günahkar mömindir. Allah, istərsə onu

bağışlayar, istərsə əzab edər. Ancaq təsdiqinə görə sonunda cənnətə girər.

a) Qurani-Kərimdə **“İman edənlər və saleh əməl işləyənlər....”**- deyə başlayan olduqca çox ayələr vardır. (Bəqərə 2/277, Yunus 10/9, Hud 11/23, Ənkəbut 29/7, Loğman 31/8, Fatir 35/7, Fussilət 41/8, Şura 42/22, Buruc 85/11, Bəyyinə 98/7). Bu ayələrdə saleh əməl işləyənlər ayrı-ayrı zikr edilmişdir. Əgər əməl imanın bir parçası olsaydı, sadəcə “iman edənlər” deyilincə, ayrı olaraq bir də “saleh əməl işləyənlər” deməyə ehtiyac qalmazdı.

b) Bəzi ayələrdə isə iman, əməlin faydalı olması üçün şərt hesab edilmişdir. **“mömin olub yaxşı işlər görən kəs isə nə zülmə məruz qalmaqdan, nə də haqqının əskilməsindən qorxar!”**[11] Bu ayədə iman əməlin şərti olaraq göstərilmişdir. Əgər iman ilə əməl eyni şey və ya əməl imanın bir hissəsi olsaydı, o zaman iman ilə əməl ayrı-ayrı zikr edilməyəcəkdi.

c) Bəzi ayələrdə böyük günahın imanla bir arada ola biləcəyi zikr edilmişdir. Bu ayələrdən birində **“Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa, onları dərhal barışdırın.”[12]** buyurulmuş, böyük günah hesab edilən öldürmə felini işləyərək əməli tərk edən insanlardan “möminlər”- deyə bəhs edilmişdir. Əgər əməl imanın bir hissəsi olmasaydı, bu insanlara mömin deyə xitab edilməzdi.

### B. Əməlin vacibliyi

Əməl və ibadətlərdə tənbəllik edib, ibadətlərdən boyun qaçırmaq bir mömini dindən çıxartmaz. Ancaq imanı yüksək bir mərtəbəyə çıxarmaq və belə iman sahibi insanlarla Allahın vəd etdiyi sonsuz nemətlərə qovuşmaq üçün ibadət və əməl vacibdir. Düşüncə və qəlbdə olan iman, hərəkətlərimizdə öz əksini tapmadığı müddətcə meyvəsiz bir ağaca bənzəyər. Qəlbimizdə daim parlayan iman işığının heç sönmədən davamlı parlaması və iman işığının hər an daha da qüvvətlənməsi və artması üçün ibadətə ehtiyac vardır. İbadət və əməl, həm imanı qüvvətləndirir, həm

11. Taha 20, 112
12. əl-Hücurat 49,9

də mömini cəhənnəm əzabından xilas edərək müxtəlif nemətləri əldə etməsinə vasitəçi olur. İnsan namaz, oruc kimi ibadətlərin fərz olduğunu, şərab içmək, zina etmək və adam öldürmək kimi qadağaların haram olduğunu qəti olaraq qəbul etdiyi halda, fərzləri ifa etməz, haram işlərlə məşğul olarsa, imandan çıxmaz, ancaq, imanın kamalını itirmiş, nurunu zəiflətmiş olar. Qolları və budaqları kəsilən ağac yenə ağacdır, ancaq öz gözəlliyini itirmiş bir ağacdır. Bu vəziyyəti ilə ağac bir gün quruya bilər. Əməlsiz imanda buna bənzəyir. Bu baxımdan "imanı qorumaq, əldə etməkdən çətindir" sözü məşhur olmuşdur.

### C. Təqlidi iman- istidlali iman

Məlum olduğu kimi ilk dini duyğu və düşüncə uşağa ailədən gəlir. Belə ki, uşaq necə ana dilini ailədən öyrənirsə, dini duyğu və düşüncəni də ailədən öyrənir. Uşaq pis və yaxşını muhakimə edəcək səviyyəyə gələnə qədər dini mənada gördüyünü və eşitdiyini mənimsəyər. Buna "Təqlidi iman " adını veririk. Yetkinlik yaşına çatan bir insan ağlı ilə hərəkət edərək varlıqları və hadisələri necə qarşılaşdırırsa, eləcə də dini həqiqətləri ağıl süzgəcindən keçirməyə, onların həqiqətə uyğunluğunu yenidən təsdiq edib mənimsəməyə məcburdur. Buna da "İstidlali iman" deyirik. Bundan məqsəd sadə bir şəkildə ağlını işlədərək bir insanın həqiqətləri görüb dinin həqiqətə uyğunluğunu öz ağlı ilə dərk etməsidir.

Belə bir imana sahib olmayan bir insanın Təqlidi iman adı verdiyimiz bir iman səviyyəsində qalması, o insanın imanının zəif olaraq qalmasına və hər hansı bir problemlə qarşılaşdığında müqavimət göstərə bilməyəcək qədər zəif dini inanca sahib olmasına gətirib çıxardar. Uşaqların və gənclərin məktəb illərində din təhsili ilə məşğul olmaları imanın qüvvətli olması baxımından son dərəcə əhəmiyyətlidir.

### D. İmanın səhih olmasının şərtləri

Bir imanın səhih olması və sahibini axirət həyatında əbədi səadətə və qurtuluşa çatdırması üçün o insanda aşağıdakı şərtlərin olması zəruridir:

a) İman tərəddüddən uzaq olmalıdır. Müsəlman olmayan bir insan son nəfəsində uğrayacağı əzabı görər və ondan sonra iman etməyə qərar verərsə iman səhih olmaz. Bir ayədə **“Onlar əzabımızı gördükdə dedilər: “Biz yalnız Allaha iman gətirdik, qoşduğumuz şərikləri isə inkar etdik!” Amma əzabımızı gördükləri zaman iman gətirmələri – Allahın Öz bəndələri barəsində öncə olub-keçmiş adətinə müvafiq olaraq- heç bir fayda vermədi. Kafirlər də oradaca ziyana uğradılar”**[13]- deyə buyurularaq ümidsüz olaraq son nəfəsdə gətirilən imanın heç bir faydasının olmayacağından bəhs edilir. Çünki, imanda əsas olan qeyb aləminə iman etməkdir. Əzabı gördükdən sonra qeybə iman etmənin heç bir mənası yoxdur.

b) Mömin, inkara və ya dini yalanlamağa əlamət olacaq hər cür hal və hərəkətdən uzaq durmalıdır. Çünki, belə halları insan təkrar etdikcə artıq o iş öz ciddiyyətini itirər və zamanla insanı küfrə və inkara sürükləyər. Ətraf mühitdəki insanlarda da şübhə yaradar və o insanların da belə hərəkətlərə meyl etməsinə səbəb yaradar.

c) İman bütünlük daşımalıdır. İmanın şərtlərinin biri digəri ilə bağlı olub, bir bütünlük təşkil edir. İmanın təsirli olması üçün bu şərtlərin hamısına inanmaq və aralarında fərq görməmək lazımdır. İman əsaslarının birini qəbul etməyən şəxs, digər şərtlərinə inansa belə inancı qəbul olmaz. Məsələn: imanın digər şərtinə inandığı halda namazın fərz olduğunu qəbul etməyən kimsə mömin olaraq qəbul edilə bilməz.

d) İman edən adam, qorxu və ümid arasında olmalıdır. Mömin “onsuz da imanım var, bu səbəblə mən mütləq cənnətə gedəcəyəm” düşüncəsiylə Allahın əzabından əmin olması və ya “çox günah işlədim, mən mütləq cəhənnəmdəyəm”- deyə Allahın rəhmətindən ümidini kəsməsi imanın itirilməsinə səbəb ola bilər. Allah Təala iki ayrı ayədə belə buyurur: **“Allahın mərhəmətindən yalnız kafirlər ümidini üzər.”**[14] **“Allahın dolaşdırıb bəla toruna salmayacağına özlərinə zərər eləyənlərdən başqa heç kəs arxayın ola bilməz!”**[15]

Bura qədər müxtəlif yönlərini ələ aldığımız iman əsasları qarşısında insanları üç qrupa ayırmaq mümkündür.

13. əl-Mumin 40, 84-85.
14. Yusuf 12, 87
15. əl-Əraf 7, 99

a) Möminlər. Bunlar inananlar, iman əsaslarını qəlbən təsdiq edənlərdir. Başqa bir ifadə ilə Allahdan aldığını insanlara təbliğ etdiyi xüsusda Hz. Peyğəmbəri təsdiq edənlərdir. Bunlar dünyada müsəlman müamələsi görür (müsəlman qadınla evlənə bilir, öləndə cənazə namazı qılınır və s.). Axirətdə, günahkardırlarsa bir müddət əzab görsələr də, sonunda cənnətə girər və əbədi səadətə vəsilə olarlar.

b) Kafirlər. Bunlar həqiqəti örtənlər, iman əsaslarından birini və ya bir neçəsini inkar edənlərdir. Belə insanlar dünyada insan hüquqlarına sahib olsalar da, möminlərə xas olan hüquqlardan məhrum olarlar. Axirətdə isə əbədi əzaba məruz qalarlar.

c) Münafiqlər. Həqiqət qarşısında iki üzlü davrananlar, qəlbən iman etmədikləri halda, xarici görkəmdən "müsəlman" kimi özlərini göstərən, müsəlman kimi hərəkət edənlərdir. Münafiqlər, müsəlmanların arasına qarışdığı və müsəlmanlardan seçilmədiyi üçün insanlar tərəfindən müsəlman kimi qarşılanarlar. Ancaq Allah dərgahında kafir olduqları üçün axirətdə əbədi əzaba düçar olurlar. Qurani-Kərimdə belə buyurulur: **"Həqiqətən, Allah münafiqlərin və kafirlərin hamısını Cəhənnəmdə bir araya toplayacaqdır."**[16]

## E. Böyük günah-Kiçik günah

Böyük günah: Kəbirə, ayə və hədislərdə böyük günah olaraq zikr edilən, haqqında təhdid edən ayə və hədis olan, işləyənin axirətdə və dünyada cəza almasına səbəb olan hal və hərəkətlərdir. Böyük günahların ən böyük olanı Allaha ortaq qoşmaq və küfrdür. Peyğəmbərimiz bir hədisində belə buyurmuşdur: **"Sizə böyük günahların ən böyüklərindən xəbər verim mi? Onlar: Allaha ortaq qoşmaq, ana-ataya itaət etməmək və yalan danışmaqdır."**[17]

Bir başqa hədisdə Hz. Peyğəmbərimiz: ***" Əməlləri məhv edən yeddi günahdan özünüzü qoruyun. Onlar: Allaha ortaq qoşmaq, sehirlə məşğul olmaq, günahsız yerə adam öldürmək, yetim malını yemək, faiz yemək, savaşdan qaçmaq, namuslu və iman əhli olan bir qadına***

16. ən-Nisa 4, 140.
17. Buxari, Ədəb, 6; Müslim, İman, 38.

***zina təklif etmək"***[18]-deyə buyuraraq böyük günahların yeddi olduğunu xəbər vermişdir.

Böyük günah işləyənə Mürtəkibi Kəbirə və ya fasiq deyilir. İmanın, təsdiq, dil ilə söyləmək və əməldən ibarət olduğunu söyləyən Xaricilər və Mutəziləyə görə fasiq mömin deyildir. Xaricilərə görə kafir, mutəziləyə görə iman ilə küfr arasında bir mərtəbədədir. Tövbə etmədən ölsə əbədi cəhənnəmlik, tövbə edərsə mömin olar. Əhli Sünnəyə görə, müxtəlif səbəblərdən böyük günah işləyən insan mömindir, ancaq o böyük günah işlədiyi üçün cəza görəcəkdir. Belə insan üçün tövbə qapısı da açıqdır. Allah Təala belə bir insanı istərsə bağışlayar, istərsə şəfaət edilməsinə icazə verər, istərsə günahının ölçüsünə görə onu cəzalandırar. Ancaq, qəlbində imanı olduğuna görə onu cənnətinə göndərər. Şirk və küfür xaricində böyük günah işləyənlərin kafir deyil, mömin olduqlarını bəyan edən ayələr vardır:

a) **"Ey iman gətirənlər! Öldürülən şəxsdən sizin üçün qisas almaq hökmü qərara alındı."**[19]**-** deyə bəhs edilmişdir.

b) **"Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa, onları dərhal barışdırın"**[20]-deyə bəhs edilən ayədə vuruşanlar, möminlər olaraq adlandırılmışdır.

Böyük günah işləyən insanın mömin olub, kafir olmadığına dair Əbu Zərr əl-Ğiffarinin rəvayət etdiyi bu hədis bu məsələyə dəlildir. Hədisdə belə buyurulur: Allahın elçisi ***"****Allahdan başqa heç bir ilah yoxdur dediyi halda, ölən elə bir insan yoxdur ki, o cənnətə getməsin****"***-deyə buyurdu. Mən,

- O insan zina etsə, oğurluq etsə də? dedim. Bunun üzərinə Rəsulu Əkrəm,

- "*Bəli, zina etmiş, oğurluq etmiş də olsa cənnətə girər***"** cavabını verdi. Mən təkrar soruşdum, eyni cavabı verdi. Bu üç dəfə təkrarlandı. Dördüncüdə isə Rəsulullah,

*- "Əbu Zərrin bu vəziyyətdən xoşu gəlməsə belə"-deyə buyurdu.*[21]

18. Buxari, Vəsayə 23; Müslim, İman, 38.
19. əl-Bəqərə 2, 178.
20. əl-Hucurat 49, 9.
21. Buxari, Tövhid, 33; Müslim, İman, 40; Tirmizi, İman, 18.

Əsri səadətdən zamanımıza qədər, böyük günah işləyən insan -əgər işlədiyi günahı halal saymırsa- mömin olaraq qəbul edilmiş, belə insanların cənazə namazı qılınmışdır.

## I. İMANIN VACİBLİYİ

### A. Allaha inanmanın vacibliyi

İnsanlıq tarixi bizə göstərir ki, ən qədim zamanlardan bəri hər dövrdə yaşayan insanlarda Allah fikri və ona ibadət etmə düşüncəsi, buna bağlı olaraq da bir din inancı vardır. İnsanlar, ən qədim zamanlardan bəri kainat dediyimiz bu dünyada qüdrət sahibi bir varlığa inanmış və ona ibadət etmişdir. Lap qədim zamanlarda mağaralarda yaşayan insanların belə yaşadığı yerlərdəki daşlar üzərinə çəkdikləri şəkillərdən də onların bir din düşüncəsinə sahib olduqları anlaşılmaqdadır. Bu duyğu, yəni Allah inancı insanda doğuşdan var olduğunda şübhə yoxdur.

Hər şeyi bilən və hər şeyi yaratmağa gücü çatan Allaha inanmaq, yetkinlik yaşına çatan və ağıllı olan hər insana fərzdir. İlahi dinlərin kəsildiyi zamanlarda və ya heç bir dindən xəbəri olmayan, dağda ya da cəmiyyətdən uzaqda yaşayan insanlar belə ağıllarıyla Allahın var olduğunu və bir olduğunu qəbul etmək məcburiyyətindədirlər. Çünki, insan, yaradılışdan özündə var olan uca bir varlığa inanma duyğusu ilə kainatda insanı heyrətə salan bu nizam-intizamın tək və bənzəri olmayan sahibinin olduğunu, yəni Allah Təalanın varlığına inanmaq məcburiyyəti vardır. Qurani-Kərimdə də bu xüsusda Allah Təala belə buyurur: **“Göyləri və yeri yaradan Allaha da şübhə etmək olarmı?!”**[22]

### B. Allahın varlığının dəlilləri

Bəzi İslam alimlərinəinə görə insandakı Allah inancı zəruri və yaradılışdan var olduğu üçün Allahın varlığına dair ətraf mühitdən dəlillər axtarmağa, ağıla və məntiqə uyğun olan dəlillər göstərməyə ehtiyac

22. İbrahim 14, 10

yoxdur. Fitrəti pozulmayan və ruhi xəstə olmayan hər insan Allahın var olduğunu və bir olduğunu bilir. Bu baxımdan Allahın varlığına aid göstərilən dəlilllər sadəcə insanın diqqətini çəkmək, qəlbindəki bu düşüncəni daim canlı tutmaq üçündür. İnsan da, xarici və daxili aləmdə Allahın varlığına dəlalət edən bu şeyləri görəcək və anlayacaq qabiliyyətdə yaradılmışdır. Əslində Allahı (c.c) hissiyyatla bir başa dərk etmək olmaz. Belə ki, Qurani-Kərimdə Allah Təala **"Gözlər onu dərk etməz. O, gözləri dərk edər."**[23]- deyə buyurur. Ancaq, hissiyyatımız Allahı tanımaqda ağlımıza köməklik göstərir. Bu köməklik bütün məxluqatdan, kainatın ahəngindən və nizamından ibarətdir. Allah Təala belə buyurur: **"Biz öz qüdrət nişanələrimizi onlara həm xarici aləmdə, həm də onların öz daxilində mütləq göstərəcəyik."**[24]

Allah Təalanı tanıma yolları və Onun varlığının dəlilləri saymaqla bitməz. Yaşadığımız bu dünyada, ucu-bucağı olmayan kainatda saysız hesabsız canlılar yaşamaqdadır. Bildiyimiz kimi bu canlıların içində ən yeganə şüurlu varlıq insandır. İnsan hər şeydən əvvəl öz varlığından xəbərdardır. Yəni insan, özünün var olduğunu bilir və "Mən varam, mən yaşayıram" deyir. İnsan öz varlığından əlavə kainatda başqa varlıqların da var olduğunu bilir.

Daha uşaq yaşdan etibarən insanlar, bu "varlıq" haqqında düşünürlər. Kiçik yaşdan etibarən insanlar, ətraf mühitindəki sadə hadisələrdən başlayaraq mürəkkəb hadisələrə qədər zincirvari bir düşüncəyə qərq olurlar. Bu düşüncə sistemində insan, səbəb və nəticə arasında bağlantı quraraq fikirləşir. Başqa bir ifadə ilə, zehində nəticələrin səbəbini axtarma fəaliyyətinə davam edir. Nümunə olaraq:

Elə bir ailə fikirləşək ki, o ailədə çörəyi evə ata gətirir. O ailədə yetişən uşağa görə evə çörəyin gəlmə nəticəsinin səbəbi atasıdır. Uşaq bir az böyüdükdən sonra ona aydın olur ki, atası çörəyi mağazadan alır. Daha sonra aydın olur ki, mağazaya çörək başqa yerdə bişirilərək gəlir. O uşaq zehnində çörəyin nəticəsinin səbəbini daha uzaq yerlərlə əlaqələndirir. Daha sonra dəyirmanla və əkinçiylə əlaqələndirir. Əkinçi də buğdanı tarladan əldə edir. Yaxşı bəs ağılsız torpağa sadə bir toxumun emal edilməsini kim öyrətmişdir?

23. əl- Ənam 6, 103
24. Fussilə 41, 53

Uşaq bu sualları cavablandıraraq artıq böyümüş, yetkinlik yaşına çatmışdır. Əgər bu uşaq böyüdüyü müddət ərzində xarici təsirlərə məruz qalmamış və təbii xüsusiyyətlərini qoruyaraq saxlamışsa, normal olaraq bütün varlıq və hadisələrin ilk səbəbini tapar, böyük yaradıcının varlığını mənimsəyər.

Qurani-Kərimdə də haqq din duyğusu üçün "fitrətullah" kəlməsi istifadə edilmişdir. Belə ki Allah Təala bir ayədə: **"Batildən haqqa tapınaraq üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə tərəf tut. Allahın dinini heç vəchlə dəyişdirmək olmaz. Doğru din budur, lakin insanların əksəriyyəti bilməz."**[25]-deyə buyurmuşdur. Hədisi şərifdə də belə buyrulmuşdur: *"Hər doğulan bir fitrət üzrə (din düşüncəsi ilə) doğular. Ancaq o uşağın anası və ya atası onu öz dinlərinə yönləndirərlər. Yəhudi isə yəhudi, xristian və ya məcusi isə xristian va ya məcusi olaraq yetişdirərlər."*[26]

Başqa bir hədisdə də Peyğəmbərimiz belə buyurur: *"Allah Təala buyurur ki: Mən bəndələrimin hamısını küfürdən və günahlardan təmizlənmiş olaraq yaratdım. Ancaq gəl ki, şeytanlar onları azdırmışdır."*[27]

Bura qədər anlatdığımızdan məlum olur ki, yetkinlik yaşına çatan, ağlını və şüurunu itirməyən insan Allahın varlığını qəbul edir. Buna baxmayaraq, inanmayan və ya inanmadığını söyləyən insanlar da vardır. Demək ki, belə insanlar təbii yaradılışlarını qoruya bilməyən insanlardır. Belə insanlar qarşı tərəfin təsirində qalan və inkar edən cərəyanların əsarətindən qurtulmayan insanlardır. Rəsulu Əkrəm, bir az əvvəl bəhs etdiyimiz hədisində uşaq üçün ilk və ən təbii ətraf muhit olaraq ailə mühitinə işarə etmişdir. Bu gün, insanlar arasında əlaqələrin həddindən çox artması səbəbilə dünyada müxtəlif düşüncələr arasında məsafə qalmamışdır. Xüsusilə də, bu fikirlər maddi mənfəəti təmin edən qruplar tərəfindən dəstəklənir və arxasında başqa ideologiyalar meydana çıxırsa...

Nə olarsa-olsun "inanmaq" insanın təbii xüsusiyyətlərindən biridir. İnsan özündən və ətrafından təbiətə hakim olan, sonsuz qüdrət sahibi bir yaradıcının var olduğu inancından ayrılmaz. İnsan bu inancla dünyaya

---

25. ər-Rum 30, 30
26. Buxari, Cənaiz, 93; Müslim, Qədər, 6.
27. Müslim, Cənnə, 16.

gəlir və bu inancla dünyadan köçür. Həyatdan ümidini kəsən və artıq öləcəyindən əmin olan hər insan son saniyədəki ömründə istər-istəməz həqiqəti qəbul edir. Deməli, dünya adlanan və iki qapısı olan yerə imanla girilər, ondan imanla çıxılar. Giriş anındakı iman təbii, şüursuz və iradəsiz bir haldır. Çıxış anındakı iman isə - şüurlu olsa belə - ixtiyarsız, məcburidir. Belə bir imanın sahibinə faydasının olmayacağı Qurani-Kərimdə zikr olunmuşdur. Əsl qəhramanlıq odur ki, doğuşdan insanda var olan iman qabiliyyətini yeniyetmə çağından etibarən inkişaf etdirsin, dünyaya vida edərkən də həyatı boyunca sahib olduğu bir iman ilə Allahın hüzuruna çıxsın.

## II. İNKAR PROBLEMİ VƏ İNKAR EDƏN QRUPLAR

### A. İnkar problemi

Tarixdən məlum olur ki, müasir dövrümüz də daxil olmaqla müxtəlif dövrlərdə insanların böyük əksəriyyəti inanmış, inanmayan qruplar hər zaman az olmuşdur. Burada qəsd olunan inanc, insana və təbiətə hakim olan, sonsuz qüdrət sahibi bir yaradıcının varlığına könül bağlamaqdan ibarətdir. İnanan insanlardan bəziləri bu yaradıcının vəsfləri xüsusunda səhvə yol verə biləcəkləri kimi, Onun göndərdiyi əmr və qadağan etdiyyi məsələlərlə yanaşı tövsiyə etdiyi şeylər haqqında da sağlam bir biliyə sahib olmaya bilərlər. Kainatı yaradan, inkişaf etdirən və idarə edən uca varlığı ən gözəl vəsflərlə tanıdan, onun əmr, qadağa və tövsiyələrini doğru olaraq xəbər verən haqq dindir. Haqq din olan İslamiyyətdə bu varlığın adı Allahdır.

“Bilməmək” mənasına gələn inkar “kainatın, canlı cansız bütün varlıqların bir yaradıcısının olduğunu bilməmək, tanımamaq, yəni Allahın varlığını qəbul etməmək” deməkdir. İnkarcılıq eramızdan əvvəlki əsrlərdə də olub hər əsrdə az-çox tərəfdar toplamışdır.

İnsan özünün var olduğunu bilir. Ətrafında olan təbiəti və kainatı da görür və onların varlığına şübhə etmir. O zaman belə insan, bir sual ilə qarşı-qarşıya qalır: “məni və bu təbiəti yaradan kimdir?” İnsanın özü də

təbiətin bir hissəsi olduğunua görə bu sual belə də soruşula bilər: Kainatı yaradan kimdir?

Bu problemin həllində ortaya atılacaq alternativləri belə sıralamaq mümkindür. Bunları sıralarkən münaqişənin dayandığı üç əsas nöqtəni də unutmayaq (insan, kainat, Allah)

- Kainatı insan yaratmışdır.

- Kainatın özünü kainat yaratmışdır.

- Kainat yaradılmamışdır.

- Kainatı Allah yaratmışdır.

İnsan, kainatın insan tərəfindən yaradıldığına ehtimal verməz. Çünki, insan yaxşı bilir ki, özü daha həyatda yoxkən kainat var idi.

Kainatın öz-özünü yaratmış olduğu ehtimalı da, normal bir düşünmə qabiliyyəti olan insan üçün təbii deyil. Çünki, bir şeyin yarada bilməsi, yaradıcı ola bilməsi üçün özünün var olması məcburidir. Ancaq buradakı bizim məntiqə görə kainat hələ özü yoxdur. Yox olan heç bir şey edə bilməz.

Üçüncü bir ehtimala görə “Kainat yaradılmamışdır” demək, çox gözəl bir sənət əsərinin varlığını qəbul edib sənətkarın varlığını qəbul etməmək, çoxlu hünəri olan bir təchizatı incələyib də onun bir yaradıcısının mövcud olduğunu inkar etmək deməkdir.

Yuxarıda məsələnin həllini tapmaq üçün anlatdığımız düşüncələrin sonuncusu isə kainatı Allahın yaratmış olduğu düşüncəsidir. Digər ehtimalları qəbul etmək normal bir ağıla və məntiqə uyğun olmadığı üçün, tarix boyunca insanların çoxu bu düşüncəni mənimsəmiş, bütün dinlər bunun üzərinə qurulmuş, bir çox fəlsəfi və elmi izah da buna dayanmışdır.

Qurani-Kərimdə mövzumuzla əlaqədar olaraq iki ayədə belə buyurulur:

**“Yoxsa onlar heç bir şeydən (xaliqsiz) yarandılar?! Yaxud onlar (öz-özlərini) yaradanlardır?!”**[28]

28. ət-Tur 52, 35.

**“Yoxsa göyləri və yeri yaratdılar?! Xeyr, onlar Allaha (ürəkdən) inanmırlar.”**[29]

**B. İnkar edən qruplar.**

**1. Materializm**

Kainatı kim yaratmışdır? Sualına verilən cavabların biri müsbət, biri mənfidir. Müsbət cavab, “Kainatı Allah yaradmışdır” deyə verilən cavabdır. Mənfi cavab isə, “Kainat yaradılmamışdır” və ya “Kainatın yaradıcısı yoxdur” deyə ifadə edilən cavabdır. Bu düşüncə tərzini mənimsəyən insanlara görə kainat və ya təbiətin meydana gəlməsi və işləməsi maddə ilə əlaqədardır. Bu səbəblə belə düşüncə tərzinə “təbiətçilik” və ya “maddəcilik” adları verilmişdir.

Materializmə görə maddə əzəlidir, yəni onun varlığının bir başlanğıcı yoxdur. O halda O yaradılmamışdır. Təbiət, maddəni təşkil edən atom zərrəciklərinin öz-özünə hərəkət etməsiylə yaranmışdır. Bu hərəkətliliyi təkrar edərək davamlılıq ərz edər.

Maddənin xaricində bir qüvvət, bir yaradıcı, bir idarəçi qəbul etməyən materialistlərə soruşmaq lazımdır. Cansız olan maddə kainatda həyatı necə meydana gətirmişdir? İnsan, heyvan və bitkilərdə olan milyonlarca həyat fəaliyyətinin mənbəyi nədir? Mən bu sualı soruşduğum an oturduğum stul, üzərində yazı yazdığım stol, yanımdakı əşyalar, çöldə seyr etdiyim dağ, daş hamısı cansızdır, hərəkətsizdir… Mən isə canlıyam. İstədiyim kimi hərəkət edirəm. Şüursuz, cansız maddəyə görə onlardan fərqim nədir ki, mən canlı olduğum halda onlar cansız və hərəkətsizdir. Daha da əhəmiyyətlisi mən ağıla, xəyal gücünə, yaddaşa sahib olduğum halda, mənim xaricimdəki bütün varlıqlar bundan məhrumdurlar. Məni və bütün kainatı yaradan, sonsuz qüdrət və hikmət sahibi bir varlıq yoxsa mənə bu həyatı, bu idrakı və bu zəkanı kim verdi? Həyatdan, idrakdan və zəkadan məhrum olan maddəmi?

Elm inkişaf etdikcə insan təbiəti daha gözəl dərk etməkdə, onun quruluşunu və işləməsini daha yaxşı qavramaqdadır. Təbiətdə bu qədər dəyişən şeylər mövcud olduğu halda, onun hərəkətini nizamlayan qanunlar

29. ət-Tur 52, 36.

heç ləngimir, dəyişmir. Biz insanlar bu qanunlara güvənərək dənizdə gəmi ilə seyr edib, havada təyyarə ilə uçuruq. Şüursuz maddə bu qədər ahəngi, sağlamlığı və fövqəladəliyi necə nizamlamaqdadır? Qurani-Kərimdə Allah Təala belə buyurur: **“Həqiqətən, Allah göyləri və yeri zaval tapmasınlar deyə, tutub saxlayır. Əgər öz məhvərindən çıxsalar, ondan başqa onları heç kəs tutub saxlaya bilməz. Doğrudan da, Allah həlimdir, bağışlayandır.”**[30]

Materialistlər, maddəni təməl əsas olaraq qəbul edirlər. “Zərrədən qalaktikaya qədər nə varsa hər şey, canlı-cansız bütün varlıqlar, maddənin əsla dəyişməyən atomlardan meydana gəlir”-deyə düşünürdülər. Ancaq müasir dövrümüzdə atomun parçalandığını bilirik. Dəyişməyən, yox olmayan, varlığı üçün bir başlanğıcı təsəvvür edilməyən Allahın yerinə qoyulan maddə, bu gün yaxşı bilinir ki, bir enerjidən ibarətdir. Bütün bunlar göstərir ki, bugün materializm elm qarşısında iflas etmişdir.

### 2. Darvinizm

Təkamül nəzəriyyəsi ilə məşhur olan İngilis biologiya alimi Darvin (1809-1882) tərəfindən inkişaf etdirilən bu düşüncə sisteminə görə, maddə yaradılmamışdır. Bu düşüncəni mənimsəyən insanlara görə təbiətə hakim olan, ona yön və forma verən uca bir varlıq yoxdur. Bitki, insan və heyvan… Bütün bu canlılarda gördüyümüz mükəmməl nizam-intizam hər çeyə sahib olan, hikmət və qüdrət sahibi olan uca bir varlıq tərəfindən yaradılmamışdır. Bu xüsusiyyətlər, uzun illər ərzində müxtəlif təsirlər nəticəsində öz-özünə yaranmışdır. Beləcə, canlılar dünyası əsrlər boyu bir təkamül yaşayaraq daha da mükəmməl bir vəziyyətə gəlir.

Nəticə etibarilə, darvincilər də, maddəni yenə maddə ilə izah edərək Allahın mövcud olduğunu rədd edirlər. Təkamül nəzəriyyəsinin tərəfdarları müxtəlif qalıntılar tapmaq, laboratoriyada müxtəlif təhlillər apararaq teoremlərini elmi əsaslara dayandırmaq istəyirlər. Apardıqları qazıntılara və təhlillərə baxmayaraq əldə etdikləri nəticələrin həqiqətə uyğun olmadığı göz önündədir. Artıq, kainatın bir yaradıcısının var olduğu, görən və düşünən insanlar üçün inkar edilməyəcək bir həqiqətə çevrilmişdir.

Qurani-Kərimdə bir çox ayədə göyü və yeri, kainatı, insanı, heyvanı, bitkiləri və s Allahın yaratdığı bəyan edilmişdir. Hər namazda oxuduğumuz

30. Fatir 35, 41.

və gündə ən azı qırx dəfə təkrar etdiyimiz Fatihə surəsinin ilk ayəsi **“Həmd olsun Allaha, aləmlərin Rəbbinə”** də təkamül nəzəriyyəsini rədd etməkdədir. Allahın isimlərindən olan rəbb kəlməsi Quranda 965 dəfə zikr edilmişdir. Bunların 62-si “Aləmlərin rəbbi, göyün və yerin rəbbi, hər şeyin rəbbi” kimi bütün varlıqlara şamil olacaq mənalar ifadə etməkdədir. Rəbb kəliməsinin kökü əslində “tərbiyə etmək, yəni bir şeyi yaratmaq, mərhələ-mərhələ inkişaf etdirərək kamala çatdırmaq” deməkdir. Darvinistlərin iddia etdikləri Təkamül nəzəriyyəsi əslində İslami mənada vardır, doğrudur. Ancaq, hər şeyi yaradan, murad etdiyi plan və hədəfə görə inkişaf etdirən sadəcə Allah Təaladır.

**3. Pozitivizm**

Allahın varlığı və yoxluğu haqqındakı münaqişələrdə göz önündə tutulan əsas ünsürlərdən biri insan, digəri isə kainatdır. Materialistlər və darvinçilər kainat məfhumu üzərində duraraq onu tanrılaşdırmış, kainatın öz-özünü nizamladığını iddia etmişdirlər. Pozitivizm ilə Freudizmi mənimsəyənlər isə, insan məfhumunu ələ alaraq, insanda Allaha inanma fikrinin mövcud olmadığını iddia emişdirlər.

Pozitivizmin qurucusu olaraq bilinən Auquste Comte (1798-1857), özündən əvvəlki düşüncə sistemlərindən faydalanaraq belə bir görüş ortaya atmışdır: Pozitiv elm dünyasına daxil olan insan, bütün təbiət hadisələrini təhlil və müşahidə edərək izah edə bilməkdədir. Beş hissiyyat orqanı ilə idrak edilən təbiətin və təbiət hadisələrinin xaricində, insanın qavrayacağı başqa bir həqiqət yoxdur. “Mən haradan gəldim, hara gedirəm” sualı pozitiv düşüncə sisteminin sualı deyil. Bu problem, təbiət hadisələri qarşısında doğru və tam elmi olmayan insanların problemidir. Problemin həllində materialistlərin və Allaha inananların fikirləri doğru deyildir.

Pozitivistlərin düşüncə tərzi “Görmədiyim şeyə inanmaram” fikrindən başqa bir şey deyil. İnsan elə şeylərin varlığını qəbul edir ki, onu görmək bir yana, hətta hissiyyat orqanlarıyla da hiss etmək qeyri mümkindür: elektrik axını, ruh və s. kimi. Heyvanlardan fərqli olaraq ağla, şüura, yaddaşa, xəyal gücünə sahib olan insan, bəzilərini gözləri ilə, bəzilərini hissiyyat orqanlarıyla, bir qismini də ağlı və muhakəməsiylə idrak edib mövcud olduğunu bilir. Bu həqiqəti rədd etmək insanlıq tarixindən xəbərsiz olmaq, bilmədən hökm vermək və cahilliyi elm ilə dəyişmək kimi bir şeydir.

Qurani-Kərimdə Allah Təala belə buyurur: **“Bir baxın, siz o kimsələrsiniz ki, bildiyiniz şeylər barəsində mübahisə edirsiniz. Bəs bilmədiyiniz şeylər barəsində niyə mübahisəyə girişirsiniz?! Əlbəttə, Allah bilir, siz bilməzsiniz!”**[31]

**4. Freudizm**

Bu görüş Viyanalı doktor Sigmund Freud (1856-1939) tərəfindən ortaya atılmışdır. “Şüur altı”nı kəşf edən və “dərinlik psixolojiyasının” icadkarı olaraq qəbul edilən Freud sinir xəstəliklərinin araşdırmacısı olmuşdur. Ona görə insana hakim olan, insanı idarə edən iki mühüm daxili güc vardır: qorxu və cinsiyyət duyğusu. İnsanın davranışlarına yön verən, ondakı ata-ana sevgisi, vətən sevgisi, Allah sevgisi kimi yüksək duyğuların meydana gəlməsinin səbəbi bu iki duyğudur. Xüsusilə də cinsiyyət duyğusu. Əslində insan ruhunda, insan psixologiyasında Allaha inanma təmayülü yoxdur. Belə ki, insan bir tərəfdən zəiflik və qorxunun, digər tərəfdən də rahatlandırılmayan cinsi arzu və istəklərinin əsarəti altındadır. Həbsdə olan məhkumun azadlıq hissi ilə həbsxana işçisinin paltarını geyərək həbsdən qaçması kimi şüur altındakı bu duyğular da özünü vətən sevgisi, valideyin sevgisi və ya Allah sevgisi olaraq göstərir. İnsanın təbiətində əslində Allah inancı, din duyğusu deyə bir şey yoxdur.

Ruhi xəstəliklərlə məşğul olan Freud, elmin sərhədlərini aşaraq fəlsəfi düşüncələrlə sahib olmuşdur. Onun ortaya atdığı fikirlər, cinsiyyətlə əlaqəli əxlaqi qaydalardan tamamilə uzaqlaşaraq Avropa mədəniyyətini əks etdirməkdədir. Əslində xəstələrlə məşğul olan Freud xüsusi halları bütün insanlara şamil etməklə çox böyük xəta etmiş və təməli olmayan bir fəlsəfi düşüncəyə sahib olmuşdur.

Qurani-Kərim səhf düşüncə və xəstə bir ruha sahib olan insanları belə təsvir etmişdir: **“Nəfsini özünə tanrı edən və Allahın bilərəkdən yoldan çıxartdığı, qulağını və qəlbini möhürlədiyi, gözünə də pərdə çəkdiyi kimsəni gördünmü? Allahdan başqa kim onu doğru yola sala bilər?! Məgər düşünüb ibrət almırsınız?”**[32], **“Belə deyirlər: Dünya həyatımızdan başqa heç bir həyat yoxdur; ölürük və dirilirik; bizi**

31. Ali-imran 3, 66.

32. əl-Casiyə 45, 23

**öldürən ancaq dəhrdir. Bu barədə onların heç bir biliyi yoxdur. Onlar ancaq zənnə qapılırlar!”**[33]

Bura qədər bəhs etdiyimiz Materializm, Darvinizm, Pozitivizm və Freudizm insanları dini həqiqətləri inkar etməyə yönləndirən qrupların tamamı deyil. Bunlardan başqa inkara sürükləyən qruplar bu günə qədər var olduğu kimi bundan sonra da ortaya çıxa bilər. Gələcəkdə insanların qruplaşması, informasiya vasitələrinin artması fərqli mənfi düşüncələrin artmasına səbəb ola bilər. Hər yaşda, xüsusilə də məktəb yaşındakı uşaqlarımız və gənclərimiz belə qrupların təbliğatına və idealogiyalarına məruz qala bilərlər.

İnsana, var olan hər səhfi göstərərək onların həllini göstərmək mümkin deyildir. Bizə lazım olan şey həqiqətləri göstərərək ona doğrunu öyrətmək, doğrunun ölçüsünü verməkdir. Qurani-Kərimdə də bu xüsusda Allah Təala belə buyurur: **“Tağuta ibadət etməkdən çəkinib tövbə edərək Allaha tərəf qayıdanları müjdə gözləyir. Bəndələrimə müjdə ver! O kəslər ki, sözü dinləyib onun ən gözəlinə uyarlar.”**[34]

Tənbəllikləri, mənfəətləri, arzularının əsiri olanlar da Allahı inkar etmişdirlər. Həqiqəti eşitməmək üçün qulaqlarını bağlamış, anlamaq istəmədikləri üçün ağıllarını dondurmuşdurlar. Onlar bu hallarını mənimsəyərək zamanla xarakterlərini itirmiş və təbiətlərini dəyişdirmişdirlər. Belə insanlar haqqında Qurani-Kərimdə buyurulur: **“Nəfsini özünə tanrı edəni gördünmü? Onun vəkili sənmi olacaqsan? Yoxsa elə güman edirsən ki, onların əksəriyyəti eşidəcək və ya fikirləşəcək? Onlar heyvan kimidirlər, bəlkə, ondan daha çox zəlalət yolundadırlar.”**[35]

Hikməti sonsuz olan, qüdrətli Allah qanunu elə qoymuşdur ki, hər zaman aydınlığın yanında qaranlıq, yaxşılığın yanında pislik, haqqın yanında batil vardır. Dünya var olduqca bu hər zaman belə olacaq, yaxşılarla pislər hər zaman bərabər yaşayacaqdır. Yaxşılar, yəni inananlar inanc sistemlərini elə yaşayacaq və yaşadacaq ki, həm özləri üçün həm də özlərindən sonra gələcək nəsillər qurtuluşa vəsilə olacaqdır.

33. əl-Casiyə 45, 24
34. əz-Zumər 39, 17-18.
35. əl-Furqan 25, 43-44.

## III. ALLAHIN VARLIĞINI İSBAT EDƏN DƏLİLLƏR

### A. Mövzunun xüsusiyyəti

Yerin, göyün, canlı və cansız bütün varlıqların yaradıcısı olan Allahın varlığına şübhə yoxdur. Lakin, buna baxmayaraq bu həqiqəti qəbul etməyənlər də mövcuddur. Allah Təala gözlə görülməyən, əllə tutulmayan bir maddə olmadığı üçün Onu inkar etmək üçün bəhanələr axtaracaqlar. Qurani-Kərimdə də, həqiqət aşkar bir şəkildə göz önündə olsa belə yenə də inkar edənlərin bu inadlarından dönməyəcəkləri belə bəyan edilmişdir: **“Əgər onlara göydən bir qapı açsaq və onunla durmadan yuxarı dırmaşsalar yenə də: “Gözümüz bağlanmış, biz sehrlənmişik”-deyərlər.”**[36]

- Göyü və yeri yaradan, buludlardan yağış yağdırıb yeri yaşıllandıran, həyat mənbəyi olan bitkiləri bitirən kimdir?

- Yer kürəsini bizim üçün iqamətgah olaraq yaradan, onu qitələrə ayırıb çaylar axıdan, uca dağlar yaradan, acı və şirin suyu bir-birinə qarışmyan dənizi yaradan kimdir?

- Həyatdan bezənin, kimsəsiz insanların yalvarmalarını eşidib cavab verən, dərdlərə dərman verən, bu qədər canlını insanın xidmətinə bəxş edən kimdir?

- Torpaq və dənizdə yol yaradıb bizə yol göstərən, qidalanmamız üçün yağışı küləklə idarə edən, insanları arxa-arxaya yaradan, öldürən, bizi göydən və yerdən qidalandıran kimdir?

Allah Təala bu xüsusda Qurani-Kərimdə belə buyurur: **“De: Sizə göydən və yerdən kim ruzi verir? Qulaqlara və gözlərə sahib olan kimdir? Ölüdən diri, diridən ölü çıxardan kimdir? Hər işi düzüb qoşan kimdir? Onlar: “Allahdır”-deyəcəklər. De: Bəs onda Allahdan qorxmursunuz? O sizin həqiqi Rəbbiniz olan Allahdır. Artıq haqdan sonra zəlalətdən başqa nə qalır?! Belə isə necə döndərilirsiniz?”**[37]

36. əl-Hicr 15, 14-15.
37. Yunus 10, 31-32.

**B. Allahın varlığına dair dəlillər**

**1. Fitrət (təbii) dəlili**

İnsan yaradılış etibarilə inanan bir canlı məxluqdur. İnanmaq insanın zehnində və ruhunda mövcuddur. Hər bir uşaq, ağlının kəsdiyi andan etibarən normal olaraq gördüyü hər şeyin kəmiyyətini və keyfiyyətini araşdıraraq "Kim düzəltdi, necə oldu?"- deyə soruşmağa başlayır. Beləcə bir gün də, qara torpaqdan bu qədər yam-yaşıl çəmənlərin necə yaradıldığını soruşacaqdır. Qurani-Kərimdə bu mövzunu belə təsvir edir: **"Bəs əkdiyinizə nə deyirsiniz? Onu bitirən sizsiniz, yoxsa Biz?! Əgər Biz istəsəydik, onu bir saman çöpünə döndərər, siz də mat-məəttəl qalardınız."**[38]Qurani-Kərimdə "Fitrətullah" deyə zikr edilən və dəyişməyəcəyi ifadə edilən budur. Buna "fitrəti ilahiyyə" və ya "fitrəti səlimə" də deyilir.

Tarixdən bizə məlumdur ki, dünyada yaşayan bütün insanların böyük əksəriyyəti kainatın böyük və qüdrətli bir yaradıcısının olduğuna şübhə etməmişdir. Bu insanların irqləri, məmləkətləri, düşüncələri, din və məzhəbləri bir-birindən fərqli olmuşdur. İnandıqları yaradıcının vəsflərini fərqli və ya bir-birinə zidd xüsusiyyətlərlə izah etmişdirlər. Ancaq xarici təsirlərə məruz qalan, şəxsiyyəti formalaşmayan, qərar verəcək səviyyəsi olmayan iradəsiz insanlar bu təbii dəlillərdən uzaqlaşaraq, inkar etmişdirlər. Bəzən də, nəfsani arzu və istəklər, şöhrət, şəhvani istəklər və mal-dövlət uğruna inkar etmişlərdir. Ancaq bunlara baxmayaraq yenə də bir çətinliklə qarşılaşdıqları zaman yenə də Allaha yönəlmişlərdir, belə ki, Qurani-Kərimdə: **"Yaxud əli yerdən üzülüb darda qalan birisi Ona dua etdiyi zaman onun duasını qəbul buyuran, şəri sovuşduran, sizi yer üzünün varisləri edən kimsə? Məgər Allahla yanaşı bir tanrımı var? Siz nə az düşünüb-daşınırsınız?"**[39]

**2. Yaradılmışlıq dəlili**

Biz, ətrafımıza baxdığımız zaman bütün varlıqların yaradılmış olduğunu görürük. Cisimlər əvvəlcə cansız olduğu halda, sonradan onlarda həyat, ağıl və şüurun yaradıldığını müşahidə edirik. Hər yaradılan şeyin bir yaradıcısının olması zəruridir. Elə isə, gördüyümüz bu varlıqların da əzəli

38. əl-Vaqiə 56, 63-65.
39. ən-Nəml 27, 62.

bir yaradıcısı vardır. O da Allah Təaladır. Bu ayələr yaradılmışlıq dəlilini ehtiva edir.

**“Elə isə insan nədən yaradıldığına bir baxsın! O, axıb gedən bir sudan yaradılmışdır.”**[40]

**“Məgər dəvəyə baxmırlar ki, necə yaradılmışdır? Göyə (baxmırlar ki)necə ucaldılmışdır? Dağlara (baxmırlar ki) necə dikəldilmişdir? Və yerə (baxmırlar ki) necə döşədilmişdir?”**[41]

**“Ey insanlar! Bir məsəl çəkildi, ona qulaq asın! Şübhəsiz ki, Allahdan qeyri ibadət etdiyiniz bütlər heç bir milçək də yarada bilməzlər-lap hamısı bunun üçün bir yerə yığışsalar belə! Əgər milçək onlardan bir şey götürüb aparsa, onu milçəkdən ala bilməzlər. İstəyən də aciz, istənilən də!”**[42]

**3. Nizam dəlili**

Bu dəlil daha çox “qayə və nizam”-deyə bilinir. Canlı və ya cansız olan bütün varlıqlar müşahidə edildiyi zaman belə nəticə əldə edilir ki, hər bir varlıq həm forması, həm funksiyası, həm də digər varlıqlarla olan münasibətində insanları heyrətə salacaq nizam və intizama sahibdir. Misal olaraq insana baxaq; insanı təşkil edən orqanlar insanın ehtiyacını yerinə yetirmək, onu təhlükələrdən xilas etmək və həyatını davam etdirmək üçün yaradılmışdır. Belə ki, orqanlardan birini hər hansı bir səbəblə itirdiyimiz zaman, onu eyni keyfiyyətdə təkrar yenidən yaratmaq mümkin deyil. Elmin və texnologiyanın inkişaf etdiyi əsrimizdə belə, hər şey bir araya gəlsə bunu eyni forma və keyfiyyətdə yaratmaq mümkün deyil. Belə isə, sayısını bilmədiyimiz bu qədər insan, heyvan, bitki və cansız varlıqlarda gördüyümüz bu qədər mükəmməl sənət əsərininin yaradıcısı kimdir?

Təcrübə edilmiş və aydın olmuşdur ki, qarışqasından dəvəsinə qədər, su damcısından göyün səmasına qədər, milçəkdən qarışqaya qədər hər şey kainatda bir plan, proqram və məqsədə uyğun olaraq meydana gəlməkdə, dəyişməkdə və təzələnməkdədir. Gecikməsi, pozulması olmayan bu

40. ət-Tariq 86, 5-7.
41. əl-Ğaşiyə 88, 17-20.
42. əl-Həcc 22, 73.

ahəng, bu nizam-intizam necə yaradılmışdır? Materialistlərə görə bu təsadüfən, Darvinistlərə görə təkamül yolu ilə meydana gəlmişdir.

Quş, uçmaq üçün qanadlı, ilan sürünməsi üçün sürünməyə uyğun bir formada yaradılmışdır. Gördüyümüz heç bir şey sistemsiz, plansız və proqramsız olaraq meydana gəlməmişdir. Təbiətdə məqsəd, nizam-intizam və hikmət vardır.

Qurani-Kərimdə nizam dəlili ilə əlaqədar olaraq çoxlu ayələr vardır. Belə ki, on dörd əsr bundan əvvəl nazil olan ayələrin bir qisminin ifadə etdiyi incəliklər məhz bu əsrdə, yəni pozitiv elmlərin və texnologiyaların inkişaf etdiyi bu dövrdə dərk edilmişdir. Elm inkişaf etdikcə daha necə mənalar öz əksini tapacaqdır. Bu mövzu ilə əlaqədar olaraq yenə müqəddəs kitabımız Qurani-Kərimdə belə buyurulur:

**“Məgər kafir olanlar göylə yer bitişik ikən Bizim onları ayırdığımızı, hər bir canlını sudan yaratdığımızı bilmirlərmi?! Yenə də iman gətirməzlər?”**[43]

**“Yeri döşəyən, orda möhkəm durmuş dağlar, çaylar yaradan, bütün meyvələrdən cüt-cüt yetişdirən, gecəni gündüzlə örtüb bürüyən Odur. Şübhəsiz ki, bunda düşünən insanlar üçün neçə-neçə dəlillər vardır! Yer üzündə bir-birinə yaxın qitələr, eyni su ilə sulanan üzüm bağları, əkinlər, şaxəli-şaxəsiz xurma ağacları vardır. Halbuki Biz yemək baxımından onların birini digərindən üstün tuturuq. Şübhəsiz ki, bunda da anlayıb dərk edən insanlar üçün əlamətlər vardır.”**[44]

**4. Əsrimizdə Allahın varlığına dair ortaya atılan dəlillər**

1. Kainat öz-özünə var olmuş, öz-özünü yaratmışdır. Kainatın var olmasında belə bir ehtimaldan bəhs etmək mümkin deyil. Çünki, səbəb və nəticə qanununa görə, hər səbəbin bir nəticəsi, hər əsərin bir müəssiri, hər yaradılanın bir yaradanı vardır. Kainatın öz-özünə yaranması, rəssam olmadan çox gözəl bir rəsm əsərinin meydana çıxması, pilot olmadan təyyarənin havada uçması, kapitanı olmayan bir gəminin qəza etmədən seyr etməsi kimi ağlın və məntiqin qəbul etməyəcəyi bir düşüncədir.

43. əl-Ənbiya 21, 30.

44. ər-Rəd 13, 3-4.

Allah Təala Qurani-Kərimdə, kainatın öz-özünə yarandığını və var olması üçün başqa bir səbəbə möhtac olmadığını söyləyənlərin nə qədər səhv düşündüklərini bəyan etmək üçün belə buyurur: **“Yoxsa onlar heç bir şeydən yarandılar?! Yaxud onlar Yaradanlardır?! Yoxsa göyləri və yeri yaratdılar?! Xeyr, onlar ürəkdən inanmırlar!”**[45]

2. Dünyanı, insanları, heyvanları, bitkiləri və cansızları yaradan, dünyanı milyon illərdir öz oxu ətrafında döndərən, olduqca böyük və çoxlu ulduzları  bir-birinə dəymədən ahəngli bir şəkildə və sürətlə döndərən bir varlığı inkar edib, bunların bir təsadüf olduğunu hansı ağıl və məntiq qəbul edər? Ona görə də heç kim bu qədər nizam və intizamla olan bu kainatın öz-özünə yarandığına və təsadüf olduğuna inanmaz. Qurani-Kərim də bunların bir təsadüf olduğunu rədd edir. Belə ki, Qurani-Kərimdə: **“Göylərin və yerin yaradılışı, dillərinizin və rənglərinizin müxtəlifliyi də Onun qüdrət əlamətlərindəndir. Şübhəsiz ki, bunda bilənlər üçün əlamətlər vardır.”**[46]

Təsadüf ehtimalını rədd etmək üçün verilən başqa bir misal da belədir: cibimizə birdən ona qədər nömrələnmiş marka qoyaq və yaxşı qarışdıraq. Sonra bu nömrələnmiş markaları sırayla birdən ona qədər çıxardmağa cəhd göstərək. Hər marka çıxardanda baxdıqdan sonra onu təkrar cibimizə qoyub, markaları təzədən qarışdıraq. Riyaziyyatdakı ehtimal hesablamasına görə, ilk olaraq cibimizdən bir nömrəli markanı çıxarma ehtimalı onda birdir. Arxa-arxaya bir və iki nömrəli markaları çıxarma ehtimalı isə yüzdə birdir. Bu nömrələri birdən ona qədər arxa-arxaya çıxarma ehtimalı isə inanılmayacaq dərəcədə imkansız və ya milyardda birdir.

3. İlk iki ehtimalın səhv olduğu ortaya qoyulunca, artıq ağıl üçün doğru olan üçüncü ehtimalı qəbul etməkdən başqa çıxış yolu yoxdur. Bu, kainatın bir yaradıcısının var olduğunu qəbul etməkdir. O da Allahdır. Allah Təala: **“Göyləri və yeri yaradan Allaha da şübhə etmək olarmı?!”**[47]- deyə buyurur.

45. ət-Tur 52, 35-36.
46. ər-Rum 30, 22.
47. İbrahim 14, 10.

Əlbəttə ki, təbiətdə təsadüfün olmadığını danmaq düzgün deyildir. Ancaq bu məhdud və məlum sərhədlər daxilindədir. Nə ilk yaradılış, nə də əsas müxtəlif dəyişikliklər təkamül yolu ilə izah edilə bilər.

Allahı inkar etmək üçün xüsusi bir cəhd göstərməyən və müasir elmdə obyektiv hərəkət edən alimlər, Allahın var olduğunu qəbul edirlər. Belə alimlər, elmin kəşf etdiyi qanunlarda Allahın qüdrətini müşahidə edirlər. Dişi və erkək olan bütün hüceyrələrdəki xromosom və genlərdəki incə ustalıq əsərinə heyran qalan Nyu-York Elmlər Akademiyasının keçmiş prezidenti A. Cressy Morrison deyir ki: bütün bu incəlikləri idarə edən dərin bir elm və məharət sahibi, uca bir varlıq mövcuddur. Qurani-Kərim də bu həqiqəti belə izah edir: **“Göylərin və yerin yaradılışı, dillərinizin və rənglərinizin müxtəlifliyi də Onun qüdrət əlamətlərindəndir. Şübhəsiz ki, bunda bilənlər üçün əlamətlər vardır.”**[48]

## IV. ALLAHIN BİRLİYİ

### A. İmanda tövhid

Qurani-Kərimdəki dünya və axirət səadəti iki şərtdən ibarətdir. Bu iki şərt “İman və əməl”dən ibarətdir. İslam dininin bu iki şərtini, yəni iman və əməli teorik və praktik olaraq özündə cəmləşdirən insan, əsl mənada dindardır. İmanda tövhid, Allah Təalanı zatında, sifətlərində, fellərində bir olaraq qəbul edərək, Ona şirk qoşmamaqdır.

#### 1. Allahın zatında tövhid

Allahın zatı, özü deməkdir. Onun zatında tövhid, onun birliyini, təkliyini və yeganə olduğunu qəbul etməkdən ibarətdir. İnsan özündə, yaşadığı kainata hakim olacaq uca bir varlığa inanmaq ehtiyacı hiss etməkdədir. İnanclarda diqqəti cəlb edən inkar deyil, şirkdir. İnsanlar dünən də, bu gün də ümumiyyətlə tanrının mövcudluğuna şübhə etməmiş, lakin Allahın birliyində və Onun kamal sifətləri mövzusunda doğru yoldan ayrılmışdırlar. Bunun səbəbi əvvəllər cahillik, indi isə iradəsizlikdir. Bunun üçün bütün peyğəmbərlər ümmətlərinə tövhidi təlqin etməyə səy göstərmişdirlər.

48. ər-Rum 30, 22.

Belə ki, Qurani-Kərimdə Allah Təala: **“Səndən əvvəl elə bir peyğəmbər göndərmədik ki, ona: “Məndən başqa heç bir tanrı yoxdur. Buna görə də yalnız mənə ibadət edin!”-deyə vəhy etməyək.”**[49]-deyə buyurur.

Allahın varlığı ağlı yerində olan və o ağlı işlətmək istəyənlər üçün necə təbii bir şeysə, Onun birliyi də təbii və qaçınılmaz bir həqiqətdir, reallıqdır. Bu həqiqəti görməmək üçün iki əngəl vardır: ya ağlın olmaması, yaxud da ağıl olduğu halda onu işlədə bilməmək. Peyğəmbərlər bunları bir növ silkələmək üçün göndərilmiş, hakimlər bunlara nəsihət vermək, alimlər bunlara işıq tutmaq, könül adamları bunların qəlblərini yumşaltmaq, tərbiyəçilər bunların iradələrini qüvvətləndimək üçün əmək sərf etmişdirlər. Belə ki, Qurani-Kərimdə Allah Təala:

**“De: Həmd olsun Allaha! Salam olsun seçdiyi bəndələrinə! Allah yaxşıdır, yoxsa Ona şərik qoşduqları bütlər?!”**

**“Yoxsa yeri məskən yaradıb ortasından çaylar axıdan, üzərində möhkəm durmuş dağlar bərqərar edən və iki dənizin arasında maneə qoyan kimsə?! Məgər Allahla yanaşı başqa bir tanrımı var?! Lakin əksəriyyəti bilmirlər!”**[50]

Qurani-Kərimdə Allahın birliyini ifadə edən bir çox ayələr vardır. Müsəlmanların həyatlarında ən çox təkrar etdikləri söz, kəlimeyi tövhiddir.

“Lə iləhə illəllah”

“Allahdan başqa Allah yoxdur”.

Lə iləhə illəllah: Müsəlmanların bayrağıdır.

Lə iləhə illəllah: Cənnətin açarıdır.

Lə iləhə illəllah: Allahı xatırlamanın ən yüksək dərəcəsidir.

Lə iləhə illəllah: İnsanın hürriyyəti, can və malının güvənliyidir.

Qurani-Kərim insanın şüuruna və anlayışına xitab edərək, kainata ibrətlə baxmasını və onun incələnməsini istəmişdir. Beləliklə insan, həm Allahın varlığını, həm də birliyini dərk edərək Onun bir olduğunu biləcəkdir. Belə ki, Qurani-Kərimdə bu xüsusda Allah Təala belə buyurur: **“Əgər**

49. əl-Ənbiya 21, 25.

50. ən-Nəml 27, 59-61.

**Allahdan başqa tanrılar olsa idi, onların ikisi də fəsada uğrayardı. Ərşin sahibi olan Allah aid etdikləri sifətlərdən tamamilə uzaqdır!"**[51]

Yəhudilər və Xristianlar ilahi dinlərə bağlı olduqları halda, Yəhudilər Hz. Üzeyri, Xristianlar da Hz. İsanı Allahın oğlu zənn etmişdilər. Şübhəsiz ki, elə düşünmək Allahın xanımının olduğu mənasına gəlir və bu da tövhidi pozan batil əqidələrdəndir.

**"Allah heç bir övlad götürməmişdir. Onunla yanaşı heç bir tanrı yoxdur. Əgər belə olsaydı, onda hər bir tanrı əlahiddə öz yaratdıqları ilə gedər və onların bir qismi digərinə üstün olmağa çalışardı. Allah müşriklərin aid etdikləri sifətlərdən tamamilə kənardır!"**[52]

**"O, göyləri və yeri var edəndir. Allahın necə övladı ola bilər ki, Onun heç bir yoldaşı (zövcəsi) yoxdur. Hər şeyi O yaratmışdır. O, hər şeyi biləndir!"**[53]

**2. Allahın sifətlərində tövhid**

Allah Təala zatında bir və tək olduğu kimi, sifətlərində də birdir. Allahı tanımaq üçün Qurani-Kərimdə özünü bizə tanıtmaq məqsədilə özü haqqında bəhs edilən vəsflərə, Onun sifətləri deyilmişdir. Varlığının başlanğıcının olmaması, sonunun olmaması, bilməsi, eşitməsi görməsi kimi sifətləri vardır. Quranda və hədislərdə Allaha nisbət edilən sifətlərin bəziləri sadəcə özünə xasdır. Bu sifətlər ondan başqa heç kimə aid deyildir. Bəzi sifətlər də kəlmə və məfhum olaraq yaradılanlar -misal olaraq insanlar- üçün də işlədilir. Bilmək, eşitmək, görmək kimi... Buna baxmayaraq bu sifətlərin əsli tam mənasıyla özünə xasdır, yaradılanların heç birinə bənzəməz. Nümunə verək:

1. Həyat (diri olmaq)

İnsan üçün düşünsək:

- Sonradan əldə edilən bir şeydir,

- Varlığı başqasından olandır,

- Yaşaması üçün bəzi şərtlərə ehtiyac hiss edən,

---

51. əl-Ənbiya 21, 22
52. əl-Muminun 23, 91.
53. əl-Ənam 6, 101.

- Sonu olan bir sifətdir.

Allah üçün düşünsək:

- Varlığının başlanğıcı olmayan,

- Varlığı başqasından olmayan,

- Yaşaması üçün heç nəyə ehtiyac hiss etməyən,

- Sonu olmayan bir sifətdir.

İslam alimləri, Qurani-Kərimin bu ayəsini tövhid mövzusunda ana prinsip olaraq qəbul edirlər: **"Ona bənzər heç bir şey yoxdur."**[54]

Yaradanla yaradılanlar arasında bənzərlik ərz etməmənin həyatımıza təsir edən iki əsas nəticəsi vardır: a) Uca Allah haqqında Onun şanına yaraşan gözəl və mənalı ifadələr işlətmək; b) Nə qədər hörmətə və şərəfə layiq olsalar da, insanlar üçün Allahın layiq olacağı kəlimə və məfhumları işlətməmək.

### 3. Allahın feillərində tövhid

Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq Allah Təala belə buyurur: **"Allah hər şeyin xaliqidir. O, hər şeyə vəkildir!"**[55] Kainatı ilk olaraq var edən, inkişaf etdirən, dəyişdirən, yaradan və hər an dəyişdirməyə gücü çatan yalnız Allahdır. Ondan başqa hər şey, canlı və ya cansız hər bir varlıq, hər hadisə yaradılmışdır. Hər şey Onun nəzarəti altındadır. O, yaradıcı olaraq da təkdir. Ondan başqa yaradıcı da yoxdur.

Heç bir müsəlman Allahdan başqa heç kimi yoxdan var edən, heç nəyi yaradıcı olaraq qəbul etməz. Belə bir düşüncə İslamın tövhid əqidəsinə ziddir.

### 4. İbadətdə tövhid

Buraya qədər izah etdiyimiz "imanda tövhid" prinsipi, imanın fikir və bilgi ilə əlaqəli yönlərini təşkil edirdi. Yəni İslamın bəxş etdiyi imani tövhid, ona inanan insanların zehinlərini və ağıllarını işlətmək qabiliyyətlərini inkişaf etdirərək dərk etmələrindən, qəbul edəcəkləri həqiqətlərdən ibarətdir. Allahı zatında, sifətlərində və fellərində tək və yeganə bilib onu uca varlıq olaraq

54. əş-Şura 42, 11.

55. əz-Zumər 39, 52.

qəbul etmək kimi.. Bir də əməli tövhid vardır. Əməli tövhid, Allahın birliyini qavrayan və dərk edən insanın qəlbiylə Onu sevməsi, davranışlarıyla bu sevgini isbat etməsidir. Bu davranışlar da ibadətlərdir.

Allah sevgisi ibadətdə öz əksini tapır. İbadət boyun əymək, itaət etmək mənasına gəlir. Müsəlmanların ən çox təkrar etdikləri kəlməyi tövhiddəki "ilah" kəliməsi "məbud" mənasındadır.

İbadətdə tövhid, qulluq etməyə, boyun əyməyə, ən çox sevilməyə, son həddə qədər təzim edilməyə layiq olanın sadəcə Allah olduğuna inanmaq, bu həqiqəti könüldən qəbul etməkdir. İbadətdə tövhidin ruhu ixlas və səmimiyyətdir. İxlas, sadəcə Allah rizasını qazanmaq, dini davranışlarda sevgi və səmimiyyətə sahib olmaqdır. Beş vaxt qıldığımız namazlarda qırx dəfə oxuduğumuz Fatihə surəsində bu səmimiyyət sinvolunu qırx dəfə təkrar edirik: **"Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik!"**[56]

İnsanlar sevgi, məhəbbət və dostluq bağları ilə bir-birinə yaxın ola bilərlər. Əlbəttə ki, bir müsəlman anasına, atasına, müəlliminə mürşidinə, böyük bildiyi insanlara qarşı hörmət göstərəcəkdir. Ancaq bu hörmət elə səviyyədə olmalıdır ki, o insan gözdə çox böyüdülərək əsla və əsla ilahlaşdırılmasın. Müsəlman, şəxsiyyətli bir insandır. Allahdan başqa peyğəmbər də daxil olmaqla heç kimə qulluq etməməlidir. Qaynaqlardan məlum olur ki, Hz. Peyğəmbərə səcdə etmək istəyən bir səhabəni peyğəmbərimiz buna görə qadağan etmiş və bunun İslam dinində caiz olmadığını ifadə etmişdir. Rəsulullah, qəbirlərin üzərində namaz qılmağı qadağan etmiş və *"Bunu bilin ki, insanların ən pisi peyğəmbərlərin qəbirlərini namazgah edən insanlardır"*[57]. *"Peyğəmbərlərin qəbirlərini namazgah edən insanlara Allah lənət etsin"*[58]-deyə buyurmuşdur. Müsəlmanların ən çox istifadə etdikləri cümlələrdən biri: **Allahuəkbər** sözüdür. "Ən böyük Allahdır" və ya "Yeganə böyük olan Allahdır"-deyə tərcümə edilən bu cümlə həm zehni, həm də qəlbi tövhidə çox gözəl bir nümunədir. Zehni tövhid faydalı biliyi yəni imanı, qəlbi tövhid məqbul əməlin meydana çıxmasına səbəb olur. Bunların ikisi də, insanların dünya və axirət səadətini təmin edir. Qurani-Kərimdə bunun

56. əl-Fatihə 1, 5.
57. Əhməd b. Hənbəl, əl-Müsnəd, I, 195.
58. Buxari, "Salat", 48; Müslim, "Məsacid", 19, 23.

gözəl nəticəsi belə təsvir edilir: **“İman gətirib yaxşı işlər görənlərin xoş halına! Onları gözəl bir sığınacaq gözləyir!”**[59]

### B. Şirk və Şirkin növləri

Şirk lüğətdə “ortaq olmaq, ortaq qoşmaq” mənasına gəlir. Şərik də, “ortaq” deməkdir. İslam dinində, Allah Təalaya zatında, sifətlərində, fellərində və ya Ona ibadət edilməsində ortağ qəbul etmək, onun oxşarı, bərabəri olduğunu ifadə etmək şirkdir. Allah Təala bu günahı işləyən insanları bağışlamayacağını və bu günahı işləyən insanların Cənnətə həsrət qalacağını belə bəyan edir: **“Şübhə yoxdur ki, Allah Özünə şərik qoşanları əfv etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlar. Allaha şərik qoşan kəs, əlbəttə, böyük günah etmiş olur.”**[60] Bir başqa ayədə isə Allah Təala: **“Allaha şərik qoşana Allah, şübhəsiz ki, Cənnəti haram edər. Onun düşəcəyi yer Cəhənnəmdir. Zalımların heç bir köməkçisi yoxdur!”**[61]- deyə buyurur.

İnsanlar bəzi zamanlarda tənbəlliyə qapılaraq, düşüncələrinin əsiri olmuş, maddi mənfəətlərin və şəhəvi arzularının cazibəsinə əsir düşərək əsil səbəbkarı unutmuş, həqiqi yaradıcını ikinci plana ataraq gözlə görülən mənfəətlərə tapmış və könül bağlamışdır. Şirkə düşən insan psixologiyasını Allah Təala Qurani-Kərimdə belə təsvir edir: **“Allaha şərik qoşan kimsə göydən düşən, quşların onu sürətlə alıb apardığı, yaxud küləyin sovurub uzaqlara atdığı bir şeyə bənzər”.**[62]

Bəli, şirk bütpərəstlik, Allahdan başqasına boyun əymək və bir şəxsiyyətsizlik, dünya mənfəətpərəstliyidir. Axirətdə, yəni o əbədi həyat olan yerdə bütpərəstlərin vəziyyətini, bütpərəstlərlə mücadilə verən peyğəmbərin dili və Qurani-Kərimin ifadəsi ilə görmək mümkündür. Belə ki, Qurani-Kərimdə Allah Təala: **“İbrahim onlara dedi: Sizin Allahı qoyub bütləri tanrı qəbul etməyiniz yalnız dünyada aranızda olan dostluğa görədir. Sonra da qiyamət günü bir-birinizi inkar edəcək, bir-birinizə**

59. ər-Rəd 13, 29.
60. ən-Nisa 4, 48.
61. əl-Maidə 5, 72.
62. əl-Həcc 22, 31.

**lənət oxuyacaqsınız. Məskəniniz cəhənnəm odu olacaq, özünüzə də kömək edən kimsələr tapılmayacaqdır!"**[63]-deyə buyurur.

**1. Böyük şirk**

Allaha qarşı işlənən günahların ən böyükləri Ona şərik qoşmaq, Onun bərabəri olduğunu düşünmək və ya qəbul etmək, Onun köməkçisi və ya rəqibi olacaq bir varlığın olduğunu qəbul etməkdir. Kainatın yaradıcısı Allah Təalaya bərabər olacaq bir varlığı düşünmək və ya təsəvvür etmək, insan yaradılışına və düşüncəsinə ziddir.

Hz. İsanın İsrailoğullarına təlqin etdiyi tövhid inancına görə, Allaha ortaq qoşanlar cənnətə girməyəcək. Lakin buna baxmayaraq onlar, Allahı bir və tək bilməklə yanaşı Onun bəzi sifətlərinin başqa varlıqlarda təcəlli etdiyinə inanmış və beləcə həm bir, həm də üçlük ziddiyyətinə düşmüşlər. Qurani-Kərim əhli kitabın belə inanclarını da şirk olaraq qəbul etmişdir. Belə ki, Qurani-Kərimdə Allah Təala: **"Söylə: Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan bir kəlməyə tərəf gəlin! Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi Rəbb qəbul etməyək! Əgər onlar yenə də üz döndərərlərsə, o zaman deyin: İndi şahid olun ki, biz, həqiqətən, müsəlmanlarıq."**[64]-deyə buyurmaqdadır.

Peyğəmbərimiz müsəlmanların və doğru yolda olanların bütlərə sitayiş etməyəcəyini xəbər verərək belə buyurmuşdur: *"Artıq şeytan namaz qılanlardan özlərinə ibadət etmələrindən ümidlərini kəsiblər."*[65]

On dörd əsrdən bəri İslam tarixində, İslam dininin sərhədləri içində qalan qruplardan bütlərə sitayiş edən, açıq şəkildə şirkə düşən insanlar yoxdur və ya yox deyəcək qədər azdır. Ancaq, fərqli bir yolla şirkə götürən və tövhid inancını zədələyən bəzi hərəkətlər vardır. Bunları belə xülasə etmək mümkindür.

**2. Yaradılanlara yüksək hörmət**

**a. Şəxslərə həddindən artıq hörmət**

İslam dini sülh və sevgi üzərinə bina edilən bir dindir. Son peyğəmbər Hz. Məhəmməd əleyhissalam dini təbliğ edərkən də insanlara sevgi

63. əl-Ənkəbut 29, 25.

64. Ali-İmran 3, 64.

65. Müslim, "Sifətül-münafiqin", 16; Tirmizi, "Bir", 25.

və mərhəmətlə yaxınlaşmışdır. Belə ki, Qurani-Kərimdə Allah Təala: **"Ya peyğəmbər de: Mən sizdən bunun (risaləti təbliğ etməyimin) müqabilində qohumlara məhəbbətdən başqa bir şey istəmirəm"**[66]**-** deyə buyuraraq bu mövzunun əhəmiyyətindən bəhs etməkdədir.

Din alimi, məzhəb imamı, təriqət şeyxi, lider, ana-ata, övlad, həyat yoldaşı, dost və s. möminin qəlbində Allah sevgisinə ortaq ola bilməz. Bu əsas prinsipə görə heç kim Allahın haram buyurduğunu halal, halal buyurduğunu haram olaraq elan edə bilməz. Heç kim dində olmayan bir şeyi dinə əlavə edə bilməz, dində olanı da dindən çıxarda bilməz. Yəhudi və Xristianların din adamlarını özlərinə Rəbb olaraq qəbul etmələrini bəyan edən ayəni, Hz. Peyğəmbərimiz belə izah edir: *"Əslində Yəhudilərlə Xristianlar din adamlarına sitayiş etməmişdilər. Ancaq yəhudi alimləriylə xristian rahibləri din yoldaşlarına halal olanı haram, haram olanı da halal edirdilər. Onlar da bunu qəbul edirdilər."* [67]

Siyər və İslam tarixi kitablarından məlum olur ki, son peyğəmbərin bütün həyatı ən incə nöqtələrə qədər təsbit edilmişdir. Adı keçən bu qaynaqlarla yanaşı xarici mənbələrdən də məlumdur ki, peyğəmbərin həyatı olduqca təvazulu keçmiş, ona həddindən artıq hörmət göstərilməsinə icazə verməmişdir. O, özünə səcdə etmək istəyən səhabəyə icazə verməmiş, bir cəmiyyətə daxil olarkən hörmət mənasıyla ayağa qalxmağı qadağan etmiş, yanına gələn bir insanın heybətdən titrəməsini gördüyü zaman "rahat ol, mən kral deyiləm, sadəcə quru ət yeyən bir Qureyiş qadınının oğluyam" demişdir. Başqa bir hörmətə isə peyğəmbərimiz, məni Allahın oturtduğu mərtəbənin üstünə çıxartmayın-deyə buyurmuşdur. Son peyğəmbər son nəfəsində də, təkrar etdiyi söz belə idi: *"Peyğəmbərlərinin qəbirlərini ibadətxanaya çevirən kimsələrə Allah lənət etsin!"*[68]

Xiristianlar Hz. İsanı tanrılaşdırdılar. Qurani-Kərim İsanın da, anası Məryəmin də insan olduqlarını, insanlar kimi yemək yediklərini ifadə etmişdir. Eyni xətaya Əsri-səadət müşrikləri də düşmüş və "Bu necə peyğəmbərdir ki, bizim kimi yemək yeyir, bazarda gəzir" demişdilər. Qurani-Kərim, peyğəmbərlərin də insan kimi bütün bəşəri vəsflərə sahib olduğunu xəbər verir.

66. əş-Şura 42, 23.
67. ət-Tövbə 9, 31; Tirmizi, "Təfsir", 10.
68. Buxari, "Salat", 48; Müslim, "Məsacid", 19.

Müsəlmanların nəzərində, heç bir insan peyğəmbər dərəcəsinə çıxa bilməz. Peyğəmbərlərə belə insan üstü bir xüsusiyyət nisbət edilmədiyinə görə heç bir kimsədə insan üstü qüvvət düşünülməyəcək, təzim və hörmət ancaq Allaha göstəriləcəkdir. Hörmət göstərmək və nəzakətli olmaq üçün çox əyilməmək, hörmət edərkən səcdə edərcəsini davranmaq, türbə və qəbirlərin üzərində hörmət əlaməti olaraq namaz qılmaq, ölülərdən imdad və kömək istəmək saf tövhid inancına və İslam şəxsiyyətinə yaraşmayan hərəkətlərdir. Əlavə olaraq "yaratmaq, dirildmək" kimi Allaha məxsus olan feil və sifətləri Ondan başqasına söyləmək təhlükəli və tövhid prinsipini zədələyən şeylərdir.

**b. Təbiəti ucaltmaq**

Təbiət Allahın sənət əsəridir. Allahın yaratdığı təbiət, qarışqadan ulduzlaraqədər çoxlu gözəlliyə, mükəmməl xüsusiyyətlərə və bənzərsiz ahəngə sahibdir. Ancaq bunların hamısı böyük yaradıcının məxluqudur, Onun əmrindədir. İnsan da Onun məxluqudur. İnsan kainatdan daha üstün və qiymətlidir. İnsan təbiət üçün deyil, təbiət insan üçün yaradılmışdır. Yer, göy, ay, günəş, ulduzlar və təbiətdə olan hər şey insanın xidmətinə verilmişdir. Allahdan başqa heç bir şey müqəddəs deyildir.

Kəbə, Həcərüləsvəd, Məscidi Nəbi, Məscidi Əqsa həcmləri, formalarına görə deyil, müsəlmanlar üçün bəzi xatirələr baxımından qiymətlidir. Hz. Peyğəmbərin hirqəsi və saqqalı da belədir. Ona görə də bunlara və buna bənzər bütün yaradılan şeylərə bir ucalıq və ya qüdsiyyət vermək olmaz. Bu baxımdan kəbə də daxil olmaqla heç bir şeyə and içmək olmaz, əlbəttə ki, Allahdan başqa. Rəsuli Əkrəm belə buyurur: *"And içmək istəyən Allaha and içsin, əks təqdirdə sussun."*[69]

Hz. Ömərin həcərül-əsvəd haqqında söylədiyi söz bu mövzunu daha da aydın izah etmək üçün əsasdır. O, "Sənin, zərərin və xeyrin olmayan bir daş olduğunu bilirəm. Rəsulullahın səni öptüyünü görməsəydim, səni öpməzdim"[70]- deyə buyurmuşdur. İnsanlardan ulduzlara tapanlar, kainatı ulduzların idarə etdiyinə inananlar da olmuşdur. Təbii ki, bu da batil bir inancdır. Demək ki, fala baxmaq və ya baxdırmaq, ulduzlardan və bürclərdən verilən xəbərlərə inanmaq batil və şirk qorxusu olan əməllərdir.

69. Buxari, "Əyman",4,5,7; Müslim, "Əyman", 1.

70. Buxari, "Həcc", 50; Müslim, "Həcc", 41.

Peyğəmbərimizin oğlu İbrahimin ödlüyü gün günəşin tutulmasını bəzi müsəlmanlar İbrahimin ölümüylə əlaqədar olduğunu zənn etmişdilər. Bunu eşidən Rəsulullah belə buyurdu: *“Günəş və ya ay heç kimin ölməsi səbəbiylə tutulmaz. Onlar Allahın (varlıq və birlik) ayələrindən iki ayədir. Tutulduğunu gördüyünüz zaman namaz qılıb, dua edin.”*[71]

Buna bənzər olaraq, bəzi günləri uğurlu, bəzi günləri də uğursuz saymaq, göz və ya qaşın səyriməsindən, qarğa və bayquşun səsindən, itin və ya pişiyin felan yerdən keçməsindən məntiqə uyğun olmayan nəticələr çıxarmaq, xüsusilə də bunları pis əlamət olaraq biruzə vermək İslamın və tövhid inancının qəbul etmədiyi şeylərdir.

### 3. Qeybin bilinməsi

Hissiyyatımızdan kənarda və biliyimizin xaricində qalan xüsuslara qeyb deyilir. Bir şeyi gözlə görmür, qulağımızla eşitmir, hissiyyat orqanlarımızla dərk edə bilmir və ağlımızı işlətməklə o mövzu haqqında aşkar bir xəbər əldə edə bilmiriksə bu, bizim üçün qeybdir, gizlidir və bilinməzdir. İslam dini qeybin sadəcə Allah tərəfindən bilinəcəyini xəbər vermişdir. Belə ki, Qurani-Kərimdə Allah Təala bu mövzu ilə əlaqədar olaraq belə buyurur: **“De: Allahdan başqa göylərdə və yerdə olan heç kəs qeybi bilməz! Onlar yenidən nə vaxt dirildiləcəklərini də bilməzlər.”**[72]

Peyğəmbərimiz baxıcıya və ya kahinə getməyi, ona müraciət etməyi, ona pul verməyi, söylədiklərini təsdiq etməyi qəti qadağan etmişdir. Bu qərar sadəcə o dövrə aid deyildi. Tövhid inancının yerləşməsi və qorunması üçün bütün dövrlərə və insanlara aiddir. Onun bu mövzu ilə əlaqədar söylədiyi hədislərdən biri belədir: *“Kim kahinə gedər və onun söylədiyini təsdiq edərsə Məhəmmədə nazil olandan uzaqlaşmış deməkdir.”*[73]

Allahdan başqa qeybi heç kim bilmir. Bu ümumi qaydanın bir istisnası vardır: Peyğəmbərlər. Allah Təala elçilərindən bəzilərini seçmiş və onlardan istədiklərinə qeyb xəbərlərindən bəzilərini bildirmişdir. Allah Təala belə buyurur: **“Qeybi bilən ancaq Odur və O öz qeybini heç kəsə əyan etməz; Bəyənib seçdiyi peyğəmbərdən başqa!”**[74] Demək

71. Buxari, “Küsuf”, 1, 2, 4, 6, 9; Müslim, “Küsuf”, 1.
72. ən-Nəml 27, 65.
73. Əbu Davud, “Tıb”, 21; İbn Macə, “Taharə”, 122.
74. əl-Cinn 72, 26-27.

ki, hər peyğəmbər qeybi bilmir, bilənlər də çox az şey bilirlər. Peyğəmbər əfəndimizin həyatına nəzər salsaq Onun bəzi qeybi bildiyini və xəbər verdiyini görərik. Əlbəttə ki, bilmədiyi şeylər də vardır. Peyğəmbərlərin göstərdikləri möcüzələr istədikləri zaman göstərə biləcəkləri bir vasitə ünsürü deyildir. Yəni peyğəmbərlər istədiyi zaman möcüzə göstərə bilməzlər. Möcüzə Allahın əlindədir. O, istərsə, yaradarsa meydana çıxar.

"Allahın sevdiyi bəndəsi və dostu" mənasına gələn vəliyə gəldikdə, əhli sünnə inancına görə vəlidən fövqəladə hadisələrin zühur etməsi mümkündü ki, -biz buna kəramət deyirik. Vəlidən zühur edəcək fövqəladə hadisəyə kəramət, peyğəmbərlərdən zühur edəcək hadisəyə də möcüzə deyilir. Ancaq möcüzəyə aid olan xüsusiyyətlər kəramətə aid deyil. Kəramət istəndiyi an həyata keçən bir hadisə deyildir. Vəli, vəli olduğunu bilməz, özündən sadir olacaq kəraməti əvvəlcədən bilməz. Kəramət bir doğuşdur, bir təcəllidir. İnsanın iradəsi və biliyi olmadan meydana gələr. Bu baxımdan "kəramət göstərmək" sözü doğru deyildir. Filan zat qeybi bilir, filan mürşid insanların daxilini bilir, şeyx müridlərin bütün hal və hərəkətlərini daima nəzarətdə və onları mənəvihi mayəsində saxlayır- demək İslam əqidəsinə, Quran və Sünnənin gətirdiyi tövhid inancına uyğun deyil. Qeyb elmini sadəcə Allah Təala bilir. Onu bu dünyada heç kim bilmir və heç kimə bildirmir. Axirət həyatı bəzi gizli sirlərin üzərindən pərdələrin qalxdığı bir aləmdir.

### 4. Günahsızlıq-Şəfaət

*"Hər insan mütləq səhv edə bilər, səhv edənlərin ən yaxşısı xətasından üz döndərəndir"*[75]-deyə buyuran Peyğəmbərimiz günahsız insanın olmadığını xəbər vermişdir. Bu ümumi qaydanın bir istisnası vardır. Bunlar da peyğəmbərlərdir. Onlar, yəni Allahın insanlara göndərdiyi elçilər, təbliğçilərdir. Ona görə ki insanlar, Allaha qarşı bəhanələr tapmasın. Bu baxımdan həm sözlərində həm də davranışlarında daim nümunəvi olan peyğəmbərlər xüsusi olaraq günahdan mühafizə edilmişdirlər. Sonuncu peyğəmbər Məhəmməd əleyhissəlam olduğuna görə, ondan sonra kim olarsa olsun, heç bir insan günahdan qorunmamışdır. Alim, sufi, filosof, məzhəb imamı, təriqət qurucusu, şeyx, lider kimi yüksək məqama sahib

75. Əhməd b. Hənbəl, əl-Müsnəd, III, 198; İbn Macə, "Zühd", 30; Tirmizi, "Qiyamə", 49.

olan insanları günahsız, xətasız, yüzdə-yüz əzabdan xilas olduğunu, cənnətə gedəcəyini düşünmək əsla doğru deyildir.

Heç bir insan haqqında "mütləq cənnətlikdir" və ya "mütləq cəhənnəmlikdir" –deyə qəti hökm vermək olmaz. Ancaq, ilahi vəhyə məzhər olan Rəsuli Əkrəm, öz dövründə bəzi insanlar (əşərei-mübəşşirə) haqqında söylədikləri müstəsnalıq təşkil edir. Rəsulullah belə buyurmuşdur: *"Sizdən biri müsəlman qardaşını övmək istəyirsə, qətiyyətlə danışmayıb belə desin: Filankəsi belə zənn edirəm. Ancaq Allahın yanında da heç kimi təmizə çıxartmıram."*[76]

Əlbəttə ki, biz övliyaya inanırıq, Quran və Sünnədə bəhs edilən Allahın vəli qullarının və dostlarının olduğunu qəbul edirik. Ancaq bunların kimlər olduğunu tam olaraq dəqiqləşdirə bilmərik. Dinə və insanlara xidmət edənlər haqqında müsbət zənn bəslərik. Vəli, Allahın dostu deməkdir. **"Allah müttəqilərin dostudur"**[77]ayəsindən məlumdur ki, Allah Ona dost olanlarla dostdur.

Biz şəfaətə də inanırıq. Qiyamət günü peyğəmbərlərin və saleh bəndələrin, Allahın icazə verəcəyi insanlara şəfaət edəcəklərini bilirik. Şəfaətə nail olacağımızı da bilmərik. Çünki, şəfaətə nail olmaq üçün qulluq vəzifəmizi layiqincə yerinə yetirməliyik. "Onsuzda necə olsa mənə şəfaət edən tapılar" deyərək ibadətlərimizə qeyri-ciddi yanaşmaq olmaz. İki cahan peyğəmbərinin son nəfəsində qızı Fatimə və xalası Safiyyəyə söylədiyi sözlər nə qədər mənalıdır: *"Qızım Fatimə, xalam Safiyyə! Sabah Allahın hüzuruna çıxmaq üçün yaxşı əməllər görün! Bunu yaxşı bilin ki, mən sizi Allahın əzabından heç bir şəkildə xilas edə bilmərəm."*[78]

Nəticə olaraq qeyd etmək lazımdır ki, peyğəmbərlərdən başqa kim olarsa olsun günahsız qəbul etmək, bəzi insanların vəli olduğunu və şəfaət edəcəyinə qətiyyətlə inanmaq birbaşa şirk olmasa da, tövhid əqidəsinə ləkə gətirən və onu zədələyən bir inancdır.

76. Buxari, "Şəhadət", 16; Müslim, "Zühd", 14.
77. əl-Casiyə, 45, 19.
78. Buxari, "Vəsayə", 11; Əhməd b. Hənbəl, əl-Müsnəd, I, 206.

### 5. Riya və Mənfəət

Riya "göstəriş" deməkdir. Dində "axirət əməlləriylə dünya mənfəəti gözləmək"-deyə tərif edilir. "Axirət əməli"-deyə qəsd edilən ibadətdir. Bu ibadət, sözlə, bədənlə və sərvət yolu ilə edilən ibadətdir. İbadətlər yalnız Allaha məxsusdur. Onun rizası üçün edilir. Biz müsəlmanlar gündə qırx dəfə **"Biz yalnız Sənə ibadət edirik, və yalnız Səndən kömək diləyirik"**[79]-deyə təkrar edirik.

Bir müsəlman, namaz qılarkən, zəkat verərkən, Quran oxuyarkən insanların ona "Nə gözəl namaz qılır, nə çox zəkat verir, nə yaxşı Quran oxuyur" demələrini düşünür və bunları bunun üçün edirsə riya etmiş olar. Rəsuli Əkrəm riyanın "balaca şirk" olduğunu qəbul etmiş və ümməti haqqında ən çox qorxduğu şeyin riya olduğunu söyləmişdir.

Bir gün səhabələrdən biri Rəsulullahın yanına gəlmiş və: "Ey Allahın elçisi, Mən, Allah rizası üçün müharibə edənlərə qatılıram, ancaq insanlar tərəfindən təqdir edilməyi də istəyirəm. Buna nə deyirsiniz?"-deyə soruşmuşdur. Hz. Peyğəmbər cavab vermədə bu ayə nazil oldu: **"Kim Rəbbi ilə qarşılaşacağına ümid bəsləyirsə, yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətə heç kəsi şərik qoşmasın!"**[80]

*"Hər ümmətin bir fitnəsi (imtahan vəsiləsi) vardır. Mənim ümmətimin fitnəsi də sərvətdir"*[81]-deyə buyuran Peyğəmbərimiz, mal və sərvət hərislərinə belə bəddua etmişdir: *"Qızıla, qümüşə və firavanlığa meyl edənə lənət olsun. O kimsəyə ki, bu sərvət ona verilsə xoşuna gələr, verilməzsə hirslənər. Lənət olsun, boynunun altında qalsın, ayağına tikan batsa çıxardanı olmasın!"*[82]

Allaha qarşı şərik qoşanların çoxu, tövhid inancında mənfəətlərinə görə etiraz etmişdirlər. Peyğəmbər əfəndimizin zamanında Məkkə müşriklərinin İslama qarşı çıxmalarının səbəbi nə idi? 360 bütlə dolu olan Məkkəni dini turizm mərkəzinə çevirərək maddi sərvətə və şöhrətə sahib olmaq. Qureyşlilər müsəlman olmaqla bu maddi sərvətdən və şöhrətdən məhrum olmaq istəmirdilər. Belə insanlar üçün Qurani-Kərimdə buyurulur:

79. əl-Fatihə 1, 4.
80. əl-Kəhf 18, 110.
81. Tirmizi, "Zühd", 26; Əhməd b. Hənbəl, "Zühd", IV, 160.
82. Buxari, "Cihad", 70; İbn Macə, "Zühd", 8.

**“Müşriklər qiyamət günü onlar üçün şəfaət diləsinlər deyə, Allahdan başqa tanrılar qəbul etdilər. Xeyr, qiyamət günü tanrıları onların ibadətlərini danacaq və onlara düşmən olacaqdır.”**[83]

Şirkin kiçiyi də, böyüyü də çirkindir. Fərd və cəmiyyət üçün fəlakətdir. Belə hərəkətlər müsəlmana, onun şəxsiyyətinə və əqidəsinə yaraşmayan davranışlardır.

Allahım! Bilərək və ya bilməyərək bir şeyi Sənə şərik qoşmaqdan Sənə sığınıram Bilmədiyim xətaların da bağışlanmasını ümid edirəm. Bütün gizli olanları Sən bilirsən, yalnız Sən!

## V. ALLAHIN SİFƏTLƏRİ

### A. Zat və Sifət

**“Ona bənzər heç bir şey yoxdur. O, hər şeyi eşidəndir, görəndir!”**[84] Bildiyimiz kimi bir varlıq və ya bir hadisə haqqında məlumat əldə etmənin üç yolu vardır: a) Hissiyyatımızla idrak etmək. b) Ağıl işlətmək. c) Xəbər almaq. Uca Allahı gözümüzlə görmək və hissiyyatımızla dərk etmək mümkin deyildir. Çünki, O, maddə deyildir. Aləmdəki varlıqların xüsusiyyətlərindən münəzzəhdir, uzaqdır. Allahı ağıl vasitəsilə Ona layiq vəsflərdə tanımaq qeyri mümkindür. Çünki, ağıl hissiyyatın verdiyi xəbərə görə nəticə əldə edir. Uluhiyyət haqqında məlumatı olmayan ağıl, heç bir nəticə əldə edə bilməz. Belə ki, o uca varlığı xəyal etmək də mümkin deyildir. Allah Təalanı tanımaq üçün tək bir vasitəmiz vardır. O, tanımaq üçün bizə veriləcək xəbərdir. Xəbər: bir hadisəni və ya bir şeyi hissiyyat orqanlarıyla idrak edib onun varlığı və keyfiyyəti haqqında başqalarına məlumat verməkdir. Uca Allahı gözləriylə görən insanlar yoxdur ki, Onu bizə anlatsın, vəsflərindən bəhs etsin. Biz Allahın zatını və mahiyyətini bilmədiyimiz və idrak edə bilmədiyimiz üçün Allahı isimləri və sifətləri ilə tanıyır və inanırıq. Qurani-Kərim **“Gözlər Onu idrak edə bilməz! Ancaq, O gözləri idrak edər. ”**[85]

83. Məryəm 19, 81-82.
84. əş-Şura 42, 11.
85. əl-Ənam 6, 133.

Hz. Aişənin söylədiyi bu cümlə bizim üçün bir rəhbərdir. "Allahım! Sənin uca vəsiflərini saymağa və Səni haqqıyla öyməyə qadir deyiləm. Sən, özünün tanıtdığın və təqdir etdiyin kimisən."[86] Bütə sitayiş edənlər Allahı söz, kəlam və rəsimlə təsəvvür etdikləri üçün Qurani-Kərimdə Allah Təala bu səhf düşüncəni tənzih etmişdir. Hər Quran tilavətinin sonunda təkrarlanan bu təzim və tənzih ayəsi də belə ayələrdən biridir. "**Sənin Rəbbin – yenilməz qüvvət sahibi olan Rəbbin Ona aid etdikləri sifətlərdən tamamilə uzaqdır!**"[87] " **Allah heç kimə möhtac deyil**"[88] cümləsi ilə "**O, hər şeyi biləndir**"[89] cümləsi Allahı çox gözəl vəsifləndirmişdir.

## B. İlahi sifətlər

Allah Təalanın nə olmadığından bəhs edən sifətlərə səlbi sifətlər, tənzihi sifətlər deyilir. Səlb də tənzih kimi yox etmək, uzaqlaşdırmaq deməkdir. Uluhiyyət məqamına yaraşmayan, əksiklik, kamalsızlıq, acizlik ifadə edən bütün sifətlər, məna və məfhumlar bu qrupa daxildir. Allahın nə olduğunu izah edən sifətlərə də sübuti sifətlər, zati sifətlər deyilir. Bunlar, var olan, mövcud olan və Allahın zatından ayrılmayan sifətlərdir. Bir də feli sifətlər var ki, bu sifətlər kainatın yaradılmasından və idarə edilməsindən bəhs edir.

### 1. Səlbi Sifətlər

Allahın şanına yaraşmayan, əksiklik və acizlik ifadə edən , yaradılmışlıq xüsusiyyəti daşıyan, bu səbəblə də Ondan tənzih edilməsi lazım olan sifətlərə deyilir. Bu cür sifətlər sayılmayacaq qədər çoxdur. Çünki, nə qədər əksiklik və acizlik məfhumu varsa, nə qədər yaradılmışlıq xüsusiyyəti mövcud isə, o qədər səlbi sifət var deməkdir. **"Ona bənzər heç bir şey yoxdur. O, hər şeyi eşidəndir, hər şeyi görəndir!"**[90] ayəsi tənzih əqidəsinin əsasını meydana gətirir. İslam alimləri səlbi sifətlərdən geniş məna ifadə edən beş dənəsini ayırmış və o sifətləri incələmişdirlər.

86. Müslim, "Salat", 222; Əbu Davud, "Salat", 148.
87. əs-Saffat 37, 180.
88. əl-İxlas 112, 2.
89. əş-Şura 42, 12.
90. əş-Şura 42, 11.

**1. Qıdəm**. Varlığının başlanğıcı olmamaq. Cənabı Allah yox ikən sonradan var olan, başqa bir ifadə ilə sonradan yaradılan bir varlıq deyil. Keçmişə doğru nə qədər gedilsə də, Allahın var olmadığı bir zamanın düşünülməsi imkansızdır. O, zatı və sifətləti ilə Qıdəmdir, Əzəlidir.

**2. Bəqa**. Allahın varlığının sonu olmaması deməkdir. Onun varlığı əbədi olaraq davam edər. O, fani deyil, ölümlü deyil, əbədidir. Ondan başqa hər şey fanidir, yox olmağa məhkumdur. Məzar daşlarında yazılan “Hüvəl-Baqi” -ölümsüz olan sadəcə odur- ifadəsi bu həqiqətin bir simvoludur. Qurani-Kərimdə keçən: **“Əvvəl də, axır da, zahir də, batin də Odur. O hər şeyi biləndir!”** [91] ayəsi Allahın Qıdəm və Bəqa sifətlərindən bəhs etməkdədir.

**3. Qiyam bi Nəfsihi**. Varlığından başqasına möhtac olmamaq. Allah Təala vacibul-vücuddur. Yəni varlığının öz-özündən olması deməkdir. Hər şey bir yaradıcıya möhtac olduğu halda, Allah Təala var olması üçün bir yaradıcıya və bir səbəbə möhtac deyildir.

**4. Vəhdaniyyət**. Şəriki olmamaq. “Allahın birliyi” mövzusundan bəhs edərkən qeyd etdik ki, Allah zatında, sifətlərində və fellərində birdir, şəriki, bənzəri, köməkçisi və rəqibi yoxdur. İxlas surəsinin ilk iki ayəsi Allahın var olduğunu və heç kimə möhtac olmadığını belə bəyan edir. **“De: O Allah birdir. Allah heç kəsə, heç nəyə möhtac deyildir!”**[92]

**5. Müxaləfətün lil-havadis**. Allahın yaradılmış olan varlıqlara bənzəməməsidir. Onun bərabəri və bənzəri yoxdur. O təkdir.

**2. Sübuti Sifətlər**

Zahiri mənalarıyla Allaha nisbət edilmələri mümkin olmayan və “xəbər sifətləri”-deyə zikr edilən “yəd” (əl), “vəch” (üz), “ayn” (göz) kimi məfhumlar İslam alimləri tərəfindən tənzih inancına uyğun olaraq şərh edilmişdir.

**1. Həyat (Allahın Canlı və Diri olması)**: Allah Təala əbədi bir həyat ilə diridir. İnsanlar hansı dinə mənsub olursa olsun, mövcudiyyətinə inandıqları tanrının ölü olduğunu, həyatda var olmadığını qəbul etməzlər. Canlılarda həyatın başlaması və davam etməsi üçün bəzi şərtlərə, zamana, ətraf mühitə ehtiyac vardır. Hər həyatın bir başlanğıcı olduğu kimi, sonu

91. əl-Hədid 57, 3.
92. əl-İxlas 112, 1-2.

da vardır. Yəni hər bir canlı ölməyə məhkumdur. Yaradılanlara aid olan bu xüsusiyyətlərin heç biri yaradana aid deyildir. Xalq arasında məşhur olan Ayətül-kürsinin ilk ayəsi bu mövzunu ehtiva edir. Belə ki, Qurani-Kərimdə belə buyurulur: **"Allahdan başqa heç bir tanrı yoxdur. (Zatı və kamal sifətləri ilə hər şeyə qadir olub bütün kainatı yaradan və idarə edən, bəndələrini dolandıran və onların işlərini yoluna qoyan) əbədi əzəli varlıq Odur."**[93]

**2. Elm (Allahın Bilməsi)**: Allah Təala gizli və aşikar, yaxın və uzaq, böyük və ya balaca olan hər şeydən xəbərdardır. İnsanlar bir şey haqqında məlumat əldə etmək üçün zaman və məkana bağlı olaraq o şeyi gözləriylə görməli və ya qulaqları ilə eşidməlidir. Biz, keçmişdə baş verən hadisələrdən xəbərsiz olduğumuz kimi, gələcəkdə də meydana gələcək hadisələr haqqında hər hansı bir məlumata sahib deyilik. Bunları bilmək üçün qarşımızda zaman əngəli vardır. Allah Təalanın elmi qarşısında zaman, məkan və maddə əngəli mövcud olmadığı üçün, O, bir şeyi bilmək xüsusunda heç nəyə möhtac deyildir. Qurani-Kərimdə belə buyurulur: **"Yeddi qat göyü və bir o qədər də yeri yaradan Allahdır. Allahın hər şeyə qadir olduğunu, Allahın hər şeyi elm (Öz əzəli elmi) ilə ehtiva etdiyini biləsiniz deyə, (Allahın) əmri onların arasında (mövcud olan bütün məxluqatda) nazil olar."**[94]

**3. Səmi (Allahın Eşitməsi)**: Allahın digər sifətlərində olduğu kimi bu sifəti də kamal dərəcəsindədir. Heç bir şərtə və vasitəyə ehtiyacı olmadan hər şeyi eşidir. Bir şeyi eşitməsi digər şeyləri eşitməsinə mane olmaz.

**4. Bəsər (Allahın Görməsi)**: İnsanlarda görmə fəaliyyətinin meydana gəlməsi üçün bəzi fizioloji və psixoloji şərtlərin olması vacibdir. Allah Təala üçün belə bir şərt və ya maneənin olması mümkün deyildir. Onun görməsi kamal dərəcəsində olduğu üçün O, hər şeyi görür. Ayələrin bir çoxunda eşitmə və görmə sifətləri bir yerdə, ancaq ayrı-ayrı zikr edilmişdir. **"Həqiqətən, Allah hər şeyi eşidəndir, görəndir!"**[95]

**5. Qüdrət (Güc və qüdrət sahibi)**: Allahın varlığına inanan insanlar, ucu-bucağı olmayan bu kainatı mükəmməl olaraq yaradan Allahın sonsuz

93. əl-Bəqərə 2, 124.
94. ət-Talaq 65, 12.
95. əl-Muminun 23, 75.

bir qüdrətə sahib olduğunu qəbul edərlər. Gücü və qüdrəti olmayan bir yaradıcı necə təsəvvür edilə bilər? Kainatın yaradılışı Ona necə nisbət edilə bilər? Qurani-Kərimdə: **“Məgər onlar göyləri və yeri yaratmış və onları yaratmaqdan yorulmamış Allahın ölüləri də diriltməyə qadir olduğunu görüb anlamırlarmı? Bəli, O, hər şeyə qadirdir!”**[96] buyurulur.

**6. İradə (Allahın diləməsi)**: Buraya qədər Allah Təalanın hər şeyə qadir olduğunu, kainatı, kainatdakı hər şeyi, hər hadisəni yaradıb onu idarə etdiyini isbat etdik. Allahın yaratması və etməsi tamamilə öz iradəsinə bağlıdır. Onun iradəsi nə məcburiyyət qarşısında qalmaqdan, nə də öz-özünə meydana gəlməkdən münəzzəhdir. O istərsə olar, istəməzsə olmaz. Onun icazəsi olmadan nə bir yarpaq əsər, nə bir ulduz sönər, nə də bir ürək döyünər. Çünki, bütün bu səltənətin hökmdarı Odur. Onun iradəsini rədd edəcək, hökmünün icrasını təxirə salacaq heç bir güc və qüvvət yoxdur. Qurani-Kərimdə: **“Əgər Allah sənə bir zərər toxundursa, onu Özündən başqa heç kəs sovuşdura bilməz. Əgər Allah sənə bir xeyir diləsə, heç kəs Onun nemətini geri qaytara bilməz. Allah onu bəndələrindən istədiyinə nəsib edər. O, bağışlayandır, rəhm edəndir”**[97] buyurulur.

**7. Kəlam (Allahın danışması)**: Onun qoyduğu qanuna görə, kəlamını ancaq mələklər və peyğəmbərlər eşidə bilər. Dünya həyatında insanların Onun kəlamını eşitməsi mümkin deyildir. Bunu da ifadə etmək lazımdır ki, Allahın kəlamı və ya söyləməsi, insanlarda olduğu kimi hərflərlə, səslərlə və ya dillə ifadə edilən kəlamlara əsla bənzəməz. Çünki, bu xüsusiyyətlər məxluqata aid olan vəsflərdir. Allah Təala bu xüsusiyyətlərdən münəzzəhdir, ucadır.

**3. Feli Sifətləri**

Bu sifətlər Allah Təalanın feillərini ifadə edən sifətlərdir. Allah, bu sifəti ilə kainatda istədiyini yoxdan var edər. Kainatda Allahın yaratmadığı heç bir şey yoxdur. Qurani-Kərimdə: **“Məxluqatı əvvəlcə yoxdan var edən, sonra da yenidən diriləcək Odur. Bu Onun üçün çox asandır. Göylərdə və yerdə olan ən yüksək sifət yalnız Ona məxsusdur. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!”**[98] buyurulur.

96. əl-Əhqaf 46, 33.
97. Yunus 10, 107.
98. ər-Rum 30, 27.

Onun yaratması, yerinə görə yaratmaq və yerinə görə yox etməkdir. İstədiyini yaşatmaq, istədiyini öldürmək, istədiyinə zənginlik, istədiyinə fəqirlik verməkdir. Kainatda canlı-cansız nə qədər məxluqat varsa, nə qədər hadisə meydana gəlirsə, o qədər də ilahi feil var deməkdir.

### C. Əsmaül-hüsna

Ərəb dilində ismin cəminə əsma deyilir. Əsmaül-hüsna “ən gözəl isimlər” deməkdir. İslam alimləri Qurani-Kərimdə və Peyğəmbərimizin hədislərində Allaha nisbət edilən yüzlərcə isim təsbit etmişdirlər. Yenə alimlərimizə görə Allahın isimləri sonsuzdur. Başqa bir ifadə ilə bunu belə söyləmək də olar: Allahın bizə bildirdikləri isimlərdən əlavə qeyb aləminə aid olub, bilmədiklərimiz isimləri də ola bilər. Əsmaül-hüsna ilə əlaqədar rəvayət edilən bir hədis belədir: *“Allah Təalanın doxsan doqquz ismi vardır. Bunları əzbərləyib sayanlar cənnətə girəcəklər”*[99]

Hədisin mətnində keçən və “saymaq”-deyə tərcümə edilən **ihsa** kəlməsi haqqında Əsmaül-hüsnanı saymaq, əzbərləmək, qaynaqlardan toplamaq, bunlara əməl etmək, mənalarını düşünmək kimi müxtəlif müzakirələr aparılmışdır. Hansı mənanı verməyimizdən asılı olmayaraq, Əsmaül-hüsnaya könüldən bağlanmaq, mənalarını düşünmək və hərəkətlərimizi ona görə tənzimləmək məcburiyyətindəyik. Allahın (Bəsir) görən və (Səmi) eşidən olduğuna könüldən bağlanan əlini və dilini pis işlərdən qoruyar, Onun (rəhman-rəhim) əsirgəyən və (Tövvab) tövbələri bağışlayan olduğunu bilən günahkarlar Allahın rəhmətindən ümid kəsməzlər.

Allahın bu isimlərini Allah ismi cəlilindən başlamaq üzrə əlifba sırasıyla qısa izah edək:

1. **Allah:** Varlığı özündən olan və bütün kamal sifətlərinin mənasını özündə cəmləşdirən həqiqi məbudun adı. İslamın tanıtdığı tək Tanrı.

2. **Adl:** Ədalət sahibi olan, hər şeyi yerli yerinə qoyan. İfrad və təfridə meyl etməyən.

3. **Afüvv:** Əfv edən, bağışlayan.

---

99. Tirmizi, “Dəvət”, 82; İbn Macə, “Dua”, 104; Müslim, “Zikr”, 5, 6.

4. **Alim:** Gizli-aşikar, yaxın-uzaq, böyük-kiçik hər şeyi tam mənasıyla bilən

5. **Aliyy:** İzzət, şərəf, mərtəb və hökmranlıq baxımından ən uca.

6. **Axir:** Ən son. Hər şey yox olduqdan sonra da var olan.

7. **Azim:** Əzəmətli, çox böyük.

8. **Aziz:** Yeganə qalib olan, uduzmayan.

9. **Bais:** İnsanları öldükdən sonra dirildən.

10. **Baqi:** Varlığının sonu olmayan, ölümsüz.

11. **Bari:** Yaradan, model olmadan bütün canlıları var edən.

12. **Basit:** Bütün canlılara rizq verən, cəsədə ruh verən.

13. **Batın:** İdrak edilməyəcək qədər gizli olan.

14. **Bədi:** Bənzəri və misli olmayan sənətkar, yaradıcı.

15. **Bərr:** Vədinə sadiq qalan. Ehsanı bol olan.

16. **Bəsir:** Hər şeyi görən.

17. **Cabbar:** Əzəmət sahibi.

18. **Cami:** Toplayan, qiyamət günü bütün canlıları bir araya toplayan.

19. **Cəlil:** Şanı uca, sifətləri etibarıyla ən üst mərtəbədə olan.

20. **Daarr:** Zərər verən, zərər verən şeyləri yaradan.

21. **Əvvəl:** İlk, varlığının başlanğıcı olmayan.

22. **Fəttah:** Açan, çətinlikləri asanlaşdıran.

23. **Ğaffar:** Çox bağışlayan.

24. **Ğafur:** Çox-çox bağışlayan.

25. **Ğaniyy:** Heç kimə, heç nəyə möhtac olmayan.

26. **Hadi:** Yol göstərən.

27. **Hafiz:** Heç nəyi unutmayan, yaddaşında saxlayan (Muhafizə edən).

28. **Hakəm:** Son hökmü verən.

29. **Hakim:** Hikmət və elm sahibi.
30. **Halim:** Cəzalandırmaq üçün tələsməyən.
31. **Hamid:** Həmd edilməyə layiq olan.
32. **Haqq:** Var olan, varlığı özündən olan.
33. **Hasib:** Qullarına kafi olub, onları hesaba çəkən.
34. **Hayy:** Əbədi həyatla diri olan.
35. **Kəbir:** Zatı və sifətləri dərk edilməyəcək qədər uca.
36. **Kərim:** Səxavətli, vəfakar, yaxşılığı sevən.
37. **Latif:** Mərhəmət və lütf sahibi.
38. **Macid:** Şanlı, şərəfli.
39. **Malik:** Görünən və görünməyən aləmlərin sahibi.
40. **Mani:** Pis və zərərli olan şeylərə mane olan.
41. **Məcid:** Şanlı, şərəfli.
42. **Mətin:** Qüvvətli.
43. **Mübdi:** İlk yaradan.
44. **Mücib:** Duaları qəbul edən.
45. **Müdill:** Alçaldan, zillət verən.
46. **Müəxxar:** Təxirə salan.
47. **Muğni:** Zənginlik verib onları xoşhal edən.
48. **Müheymin:** Kainatın bütün işlərini görən.
49. **Muhsi:** Tək-tək hər şeyin sayısını bilən.
50. **Muhyi:** Dirildən, can verən, yaşadan.
51. **Muid:** Təkrar yaradan.
52. **Müizz:** İzzət və şərəf verən.
53. **Malikül Mülk:** Mülkün sahibi.
54. **Mümin:** Güvən verən, vədinə güvənilən.

55. **Mumit:** Öldürən, ölümü yaradan.

56. **Müntəqim:** Günahkarları cəzalandıran.

57. **Muqaddim:** Qabağa alan.

58. **Muqit:** Riziqləndirən, qoruyan.

59. **Muqsid:** Ədalətlə hökm edən.

60. **Muqtədir:** Qüdrətli, hər şeyə gücü çatan.

61. **Musavvir:** Şəkil və forma verərək yaradan.

62. **Mütəali:** İzzət, şərəf, mərtəb və hökmranlıq baxımından ən uca olan.

63. **Mütəkəbbir:** Əzəmət və ucalığını izhar edən.

64. **Nafi:** Fayda verən.

65. **Nur:** Nurlandıran, nurun mənbəyi.

66. **Qabid:** Rizqi saxlayan, canlıların ruhunu alan.

67. **Qadir:** Hər şeyə qadir olan.

68. **Qahhar:** Uduzmayan, yeganə qalib.

69. **Qaviyy:** Güclü, qüvvətli.

70. **Qayyum:** Hər şeyin varlığının səbəbi.

71. **Quddüs:** Tər-təmiz, münəzzəh.

72. **Rafi:** İzzət və şərəf verən.

73. **Raqib:** Nəzarət edib, gözləyən.

74. **Raşid:** İrşad edən.

75. **Rauf:** Şəfqətli.

76. **Rəhim:** Bağışlayan.

77. **Rəhman:** Bağışlayan.

78. **Rəzzaq:** Bədənin və ruhun qidasını yaradıb verən.

79. **Sabur:** Çox səbirli.

80. **Saməd:** Arzu və ehtiyac səbəbiylə hər kəsin yönəldiyi uca varlıq.

81. **Şəhid:** Hər şeyi qoruyaraq onu bilən.

82. **Şəkur:** Az yaxşılığa çox mükafat verən.

83. **Səlam:** Səlamətlik yaradan.

84. **Səmi:** Eşidən.

85. **Tövvab:** Tövbələri qəbul edib günahları bağışlayan.

86. **Vacid:** İstədiyini istədiyi an tapan.

87. **Vahidul əhad:** Tək, yeganə, misli olmayan.

88. **Varis:** Bütün sərvətlərin yeganə sahibi.

89. **Vasi:** Zənginliyi hər fəqirə çatıb, artan.

90. **Vədud:** Çox sevən, çox sevilən.

91. **Vali:** Kainata hakim olub onu idarə edən.

92. **Vəhhab:** Qarşılıq qözləmədən bol-bol verən.

93. **Vəkil:** Güvənilib dayanılan.

94. **Vəliyy:** Köməkçi və dost.

95. **Xabir:** Hər şeydən xəbəri olan.

96. **Xafid:** Alçaldan, düşmənləri zəiflədən.

97. **Xaliq:** Hər şeyin yeganə yaradıcısı.

98. **Zahir:** Aşikar.

99. **Zülcəlali vəl ikram:** Əzəmət və kərəm sahibi.

Allahın bu isimlərini izah edərkən gördük ki, bu isimlərdən bir neçəsi qəzəbi-ilahiyyədən bəhs edir. Geri qalan bütün isimlər Allahın mərhəmətindən, lütfkarlığından, bağışlayıcılığından bəhs edir. İslam qorxuya deyil, sevgiyə, mərhəmətə, salamatçılığa dayanan bir dindir. Bir vəiz İslam haqqında vəz etsə, yüz dərsin doxsan yeddisini sevgi və mərhəmətə, iki-üç dərsi də qəzəb və qorxuya ayıracaqdır. Qurani-Kərimdəki əsmaül-hüsna ilə əlaqəli ayələrdən biri belədir: **“Ən gözəl adlar**

**Allahındır. Onu bu adlarla çağırıb dua edin. Onun adları barəsində küfr edənləri tərk edin. Onlar etdikləri əməllərin cəzasını alacaqlar!”**[100]

### D. Allahın röyada görülməsi (RUYƏTULLAH)

Əqaiddən bəhs edən kitablarda, ümumiyyətlə Allahın sifətlərindən bəhs etdikdən sonra Allahın görülməsi (ruyətullah) mövzusu ələ alınır. Bunun məqsədi, müsəlmanların qiyamət günü Allahı görəcəklərini isbat və izhar etməkdir. Qurani-Kərimdə: “**Gözlər onu görüb dərk etməz. O, gözləri dərk edər**”[101]buyurularaq Allahın dünyada idrak ediləməyəcəyini, yəni gözlə görülməyəcəyi bəyan edilmişdir. Hz. Musanın Allahı görmək istəməsinə **“Sən Məni əsla görməzsən”**[102]**-**deyə cavab verildiyi məlumdur. Peyğəmbər əfəndimizin merac gecəsi rəbbini görüb-görməməsi haqqında isə, əshabdan bu zamana qədər mübahisə vardır.

Bəzi alimlər ruyətullahın mümkin olduğunu bildirmişdir. İmanından, səmimiyyətindən şübhə edilməyən bəzi möhtərəm insanlar, röyada Allahı gördüklərini söyləmişdirlər. Bu qədər xəbəri və hadisəni heçə saymaq mümkin deyil. Bunu da qeyd etmək lazımdır ki, Allahı röyada görənlər onun həcmindən, şəklindən, məkanından əsla bəhs etməmişdirlər. Çünki, Allah maddəyə aid xüsusiyyətlərdən münəzzəhdir. Əgər röya bundan ibarət isə, bu röyadan mömin psixoloji təsir edən şey nədir? İzzət sahibi, şanı uca, mərhəmət edənlərin ən mərhəmətlisi, Allahı görmənin sevinci, həzzi, əzəməti... Demək ki, Allahı röyada görmək fiziki bir hadisə deyil, sadəcə psixoloji bir haldır, möminin daxili dünyasına aid bir həqiqətdir. Doğru yoldan ayrılmayan möminin röyası Ona güvən verir, mənəvi yolda getməsinə və rəbbinə daha da çox yaxınlaşmasına təkan verir.

---

100. əl-Əraf 7, 180.
101. əl-Ənam 6, 103.
102. əl-Əraf 7, 143.

## A. QƏDƏR VƏ QƏZAYA İMAN

Qədər və ya təqdir, termin olaraq Allah Təalanın bütün varılq və hadisələrlə kainatı əzəldə planlamasından ibarətdir. Lüğətdə “hökm etmək, əmr etmək, ifa etmək” mənalarına gələn qəza, hadisələri plana uyğun olaraq icra edib yerinə yetirməkdir. Qədər Allahın elminə, qəza da qüdrətinə əsaslanır. Qədər Allahın sifətləriylə əlaqəli olan bir mövzudur. Bütün İslam alimləri, hətta islam dinini qəbul edib mənimsəyən bütün insanlar Allahın bəzi yetkin sifətlərə sahib olduğunu qəbul edirlər. Buraya qədər ifadə etdiyimiz düşüncələrdə şübhə və fikir ayrılığı yoxdur. Ancaq təbiətdə olan hər şeyin, hər hadisənin Allahın əzəli elmi, qüdrəti və iradəsi ilə həyata keçdiyini ifadə edərkən insanların işlədikləri feillərdəki iradələri də buna daxildir. Kəlam elmində “Qədər” deyilincə ağıla bu gəlir. İnsanların feillərindəki iradə, arzu və istəklərimizlə həyata keçirdiyimiz bütün daxili və xarici davranışlarımızdır. Bu feillər iradəmizi o yönə çevirməklə meydana gəldiyi üçün, biz o davranışlardan məsul sayılırıq. Iztirari feillər isə, iradəmiz olmadan meydana gəldiyi üçün ondan məsul deyilik.

İslam alimləri “qədər” problemlərinə müxtəlif mövqedən yanaşmış, bu baxımdan məsələnin həllindəki düşüncələr də bir-birindən fərqli olmuşdur. Bəzi alimlər mövzunun ilahi sifətlər bəhsinə əhəmiyyət vermiş, elm, qüdrət və iradə sifətlərinə sərhəd qoyulacağı qorxusuyla feilləri tamamilə Allaha nisbət etmiş, qulu bu feillərdən məsul hesab etməmişdirlər. Cəbriyyə-deyə bilinən bu qrupun tərafdarları olduqca çoxdur.

Qadiriyyə və Mötəzilə adıyla bilinən ikinci qrup isə insanı öz feillərindən məsul hesab edərək feillərin iradəyə bağlı olaraq həyata keçdiyini bəyan etmişdir. Əksəriyyəti Maturidiyyə mənsubuna aid olan Əhli-sünnə alimlərinə görə, qədərlə əlaqəli Qurani-Kərimdəki ayələr və insanın psixoloji davranışları diqqətə alınaraq qərar verilməlidir.

## B. İNSAN İRADƏSİ VƏ BUNUN FEİLDƏKİ ROLU

İnsanlar feillərində, azad bir iradə hürriyyətinə sahibdirlər. Belə ki, insan öz nəfsində və işlərində hər an bunu müşahidə edir, hür və azad olduğunu görür. İnsanın hür olması, özünün hür və ya azad olduğu şüuruna sahib olması deməkdir.

İnsan azad bir iradəyə sahibdir və bu azad iradənin feilin meydana gəlməsində təsiri vardır. Ancaq, feillərin yaradıcısı Allahdır. Allah Təala insanların feillərini iradələrinə uyğun bir şəkildə yaradır. Feili seçmək və tərcih etmək qula aiddir. İnsandakı iradəni və feili yaradan isə Allahdır. Allahın insana verdiyi iradə və ixtiyar ilə hər hansı bir işi icra etməkdə azad olan insan, işlədiyi əməllərdən məsuldur. İnsan, xeyir iş görmüşsə mükafatını, şər iş görmüşsə cəzasını görəcəkdir. Qurani-Kərimdə: **"And olsun nəfsə və onu yaradana. Sonrada ona günahlarını və pis əməllərdən çəkinməsini öyrədənə"**[103]-deyə buyurulur. Başqa bir ayədə də Allah Təala belə buyurur: **"Biz ona haqq yolu göstərdik. İstər nemətlərimizə minnətdar olsun, istər nankör."**[104] Bir başqa ayədə də, Allah Təala belə buyurur: **"Yaxşı iş görənin xeyiri özünə, pislik edənin də zərəri özünə olar. Sənin Rəbbin haqsız yerə bəndələrə zülm edən deyildir!"**[105]

## C. İNSANIN FEİLLƏRİ VƏ QƏDƏR

Allaha qarşı məsul olan, başqa bir ifadə ilə şüura sahib olub mükəlləf olan üç qrup canlı vardır: Mələk, şeytan və insan ilə cin. İlahi iradə mələyə pislik, şeytana da yaxşılıq etmək qabiliyyətinin verilməməsi şəklində təcəlli etmişdir. İnsan isə ikisi arasında olub, həm yaxşılıq etmək həm də pis iş etmək qabiliyyətinə malikdir. Yəni iradə hürriyyətinə sahibdir. Allah Təala istəsəydi bu üç varlığın hər birini eyni, ya da hər birini başqa bir kateqoriyaya daxil edərdi.

Qurani-Kərimdə yer alan və bəşəri hürriyyətsizlik (cəbr) kimi diqqəti cəlb edən, ilahi iradənin hakimiyyətini dilə gətirən ayələri də, mələk ilə

---

103. əş-Şəms 91, 7-8.

104. əl-İnsan 76, 3.

105. Fussilət 41, 46.

şeytan arasında yer tutan, bəşər kateqoriyasına aid olduğunu düşünmək lazımdır. Qəza və qədər problemində münaqişə ediləcək bir mövzu vardır: Allahın elm sifəti, yəni Cənabı Haqqın kiçik-böyük, yaxın-uzaq, gizli-aşikar, olmuş və olacaq hər şeyi bilməsi. Dünyada meydana gəlmiş və gələcək hər şey Allahın elmi, istəməsi, təqdiri və yaratması ilə baş verir. Hər şeyin bir qədəri vardır. “Hər şeyin bir qədərinin olması, hər şeyin Allahın elmi, iradəsi və yaratması ilə baş verməsi” düşüncəsi etiqadi məzhəbə görə belə məna ifadə edir: İnsanların azad iradələri ilə seçdikləri şeyləri, harda və necə tərcih edəcəklərini Allahın bilməsi, bu bilgiyə görə iradə etməsi və iradəsinə görə təqdir edib, vaxtı gələndə, bəndənin istədiyinə görə yaratmasıdır. Bu baxımdan Allahın elmi qulun tərcihinə bağlı olub Allahın qula məcburiyyət mövzu bəhs deyildir. Başqa bir ifadə ilə biz, Allah Təala bildiyi üçün bəzi işləri etmirik. Biz bu işləri icra edəcəyimiz üçün Allah bunu əzəli elmi ilə bilir. Buna müxtəlif misallar vermək olar: biz günəşin və ayın tulucağını bəzi astranomiya və meteralogiya elmi vasitəsiylə əvvəlcədən bilirik. Günəş və ay biz bildiyimiz üçün tutulurmu? Yoxsa onların tutulacağını bildiyimiz üçünmü tutulur?

Bunu da unutmamaq lazımdır ki, qədər, mahiyyətini ancaq Allahın bildiyi bir sirdir. İnsanın aciz ağlı belə böyük bir problemi həll etmək üçün acizdir. İnsanın bu mövzudakı acizliyinin səbəbi, zaman məfhumu ilə yoğrulan insan ağlı və beyni, zamansızlığın da olduğu ilahi elm, iradə və qüdrəti dərk edib anlayacaq güc və qabiliyyətə malik olmamasıdır. Buna görə də Peyğəmbər Əfəndimiz qədər mövzusunda münaqişə edən əshabına belə demişdir: *“Siz bunu münaqişə etməklə məsul tutuldunuz? Yoxsa mən sizə bunun üçün göndərildim? Sizdən əvvəlkilər bu mövzuda münaqişə etdikləri üçün həlak oldular. Bir daha əsla bu mövzuda münaqişə etməyin*”[106]

Peyğəmbər Əfəndimiz bir gün yatsı namazından sonra Hz Əlinin yanına gəldi və onu yatmağa hazırlaşdığını görərək belə dedi:

- Gecə təhəccüd namazı qılırsanmı? Hz Əli belə cavab verdi.

- Ey Allahın elçisi, həyatımız Allahın əlindədir, istərsə verər, istərsə alar (Allah bizi oyandırmaq istəsə oyandırar). Bu cavabdan sonra Rəsuli Əkrəm mübarək əlini dizinə vuraraq,

---

106. Tirmizi, Qədər, 1.

- Ümumiyyətlə insan nə qədər də inadcıldır deyə buyurdu. Hz Əlinin qədəri qəsd edərək verdiyi cavabdan peyğəmbərimiz razı qalmadı və otaqdan çıxdı.

Qəza və qədərə güvənərək çalışmaqdan uzaqlaşmaq, hər hansı bir işin səbəbini axtarmaq, səbəblərə sarılmaq doğru deyildir. Allah hər şeyi bir səbəbə bağlamışdır. İnsan bu səbəbləri yerinə yetirsə, o səbəblərin nəticəsini də Allah yaradacaqdır. Bu ilahi bir qanundur.

## I. PEYĞƏMBƏRLƏRƏ İMAN

Müsəlmanlığın iman əsaslarından biri də, peyğəmbərlərə iman etməkdir. Peyğəmbər, Allah ilə insanlar arasında vasitəçi deməkdir. Allah Təala insanlar arasından seçdiyi xüsusi bəndələrini, peyğəmbərlik vəzifəsiylə şərəfləndirmiş və onlar vasitəsilə insanlara əmr və qadağalarını bildirmişdir. Peyğəmbərlərə iman etmək, insanlara doğru yolu göstərmək üçün xüsusi seçilmiş bəndələrin Allah tərəfindən göndərildiyinə və bu kimsələrin Allahdan gətirmiş olduqları bütün şeylərin həqiqət və doğru olduğuna inanmaq, peyğəmbərlər haqqında vacib, imkansız və caiz olan şeyləri, xüsusiyyətləri bilərək təsdiq etməkdir.

Peyğəmbərlik Allah vergisidir. İnsan dünyada çalışmaq və səy göstərməklə ən yüksək mərtəbələrə çıxa bilər, ancaq peyğəmbər ola bilməz. Allah Təala bütün peyğəmbərlərə -aralarında fərq qoymadan- inanmağı fərz etmişdir. Belə ki, Qurani-Kərimdə Allah Təala: **“Ey möminlər belə deyin: Biz Allaha, bizə nazil olana, İbrahimə, İsmailə, İshaqa, Yəquba və onun övladına göndərilənlərə, Musaya və İsaya verilənlərə, Rəbbi tərəfindən peyğəmbərlərə verilənlərə inanmışıq. Onların heç birini digərindən ayırmırıq. Biz ancaq Allaha boyun əyən müsəlmanlarıq”**[107]-deyə buyurur.

Bir insan peyğəmbərlərin bəzisinə inanıb, bəzisinə inanmazsa kafir olar. Bu mövzu ilə əlaqədar bir ayədə: **“Allahı və peyğəmbərlərini inkar edənlər, Allahı peyğəmbərindən ayırmaq istəyənlər, “Biz peyğəmbərlərdən bəzisinə inanır, bəzilərinə isə inanmırıq”,-deyənlər və bunun arasında bir yol tapmaq istəyənlər-Bütün bunlar, həqiqətən, kafirdirlər. Biz kafirlərdən ötrü alçaldıcı əzab hazırlamışıq!”**[108]-deyə buyurulur.

---

107. əl-Bəqərə 2, 136.

108. ən-Nisa 4, 150-151.

Allah Təala əsrlər boyu peyğəmbərlər göndərmiş, insanları peyğəmbərlər vasitəsilə doğru yola dəvət etmişdir. Allah yoluna çağıran bir peyğəmbərdən məhrum olan heç bir qövm və ya cəmiyyət mövcud deyildir. Bu barədə Quranda belə buyurulur: **"Hər ümmətin bir peyğəmbəri vardır."**[109]

## II. PEYĞƏMBƏRLİKLƏ ƏLAQƏLİ OLAN MƏFHUMLAR

Bu mövzuya aid bilgiləri daha gözəl dərk etmək və anlamaq üçün peyğəmbərliklə əlaqəli olan məfhumların bilinməsinə ehtiyac vardır. Bunların başında nübüvvət, vəhy, nəbi və rəsul məfhumları gəlir. Bunları qısaca izah etməyə çalışaq.

### A. NÜBÜVVƏT

Ərəbcə bir kəlimə olan nübüvvət "bilinməyəni xəbər vermək" deməkdir. Dini ədəbiyyatımızda peyğəmbərlik deyə nəql edilən nübüvvət, termin olaraq belə tərif edilə bilər: Kainatı yaradan Allahın, dini və dünyəvi mövzularda insanları bilgiləndirib buyuruqlarını xəbər vermək üçün seçdiyi bir insanı elçiliklə vəzifələndirməsidir. Uca Allah elçilik etməklə vəzifələndirdiyi insana hər mövzuda *vəhy* yoluyla bilgilər öyrətmiş və bunları insanlara çatdırmağı əmr etmişdir.

### B. VƏHY

#### 1. Vəhyin tərifi

Vəhy, lüğətdə "gizlicə söyləmək və bildirmək və ya gizlicə söylənən söz" mənasına gəlir. Termin olaraq isə: "Allah Təalanın müxtəlif bilgiləri söz və ya məna olaraq, bir başa və yaxud mələk vasitəsilə peyğəmbərlərə gizli olaraq bildirməsidir". Vəhyə muxatab olan peyğəmbər, iradəsi xaricində və qeyri adi bir formada idrak etdiyi bilgilərin ona Allah tərəfindən göndərildiyini əmin olaraq bilir. Bunu nəticəsidir ki, vəhy gələrkən peyğəmbər bəzi fiziyoloji və psixoloji hallar keçirdir. Belə ki, peyğəmbər vəhy alarkən soyuq

109. Yunus 10, 47.

zamanlarda tərləmiş, dəvə üzərində ikən isə vəhyin təsiri ilə dəvənin çökdüyü bildirilir. Nübüvvətin əsasını təşkil edən vəhydən, Qurani-Kərimdə Hz. Musa və Hz. İsanın anaları kimi peyğəmbər olmayan bəzi insanlara, mələklərə, atəşə, bal arısına, yerə və göyə ilahi xitab və ilhamın gəlməsi mənasında istifadə edilmişdir. Ancaq bunlar vəhyin kəlimə mənasını ifadə edib, peyğəmbərlərə gələn vəhylə heç bir əlaqəsi yoxdur.

**2. Vəhyin növləri**

Allah tərəfindən peyğəmbərlərə gələn vəhylər müxtəlif şəkillərdə öz təzahürünü göstərmişdir:

ba) Sadiq Röya: Başlanğıc zamanlarda vəhy, peyğəmbərin gördüyü röyanın eyni şəkildə meydana gəlməsiylə olurdu. Hz. Peyğəmbər nübüvvətin əvvəllərində gördüyü röyaların sabah aydınlığı kimi gerçəkləşdiyini bildirmişdir.[110] Digər peyğəmbərlər də belə vəhylər almışdırlar.[111]

bb) Vəhy Mələyinin Gətirməsi: Vəhy, bunları gətirməklə vəzifəli olan Cəbrailin əsl sifətiylə peyğəmbərə görünərək və ya insan şəklinə bürünərək, yaxud da, görünmədən peyğəmbərə vəhy gətirməsiylə olur. Hz. Peyğəmbərə bu üç yolla da vəhy gəlmişdir.[112]

bc) Vasitəsiz Vəhy: Uca Allah peyğəmbərə bir başa xitab edərək və ya onun qəlbində bir bilgi yaradaraq istədiyi xüsusları vəhy edə bilər. "Kəlimullah"-deyə bilinən Hz. Musa Tur dağında, Hz. Peyğəmbər də merac hadisəsində bu cür vəhylər almışdır. Vəhyin bu üç növünə də Quranda təmas edilmişdir.[113]

## III. İNSANLARIN PEYĞƏMBƏRLƏRƏ OLAN EHTİYACI

Çoxlu yetənək və xüsusiyyətə malik olmasına baxmayaraq zəif iradəli, duyğusal, bilgisiz, yalan danışmağa, inkar etməyə və xalqdan uzaqlaşmağa əlverişli olaraq yaradılan insanın, həyatın hər mərhələsində haqqa, əməldə

110. Buxari, "Bədül-vahy", 1.
111. Baxın Yusuf 12, 4.
112. Buxari, "İman", 37, "Bədül-vahy" 1; Müslim, "Fəzail", 87, "İman", 1.
113. əş-Şura 42, 51.

isə xeyrə uyğun gəlməsini təşkil edəcək rəhbərə ehtiyacı vardır. Sosial bir varlıq olaraq yaradılan insanın həmcinsləri ilə sülh və əmin amanlıq içində yaşamağın qanunlarını öz-özünə tapması imkansız dərəcədə çətindir. İnsanları bu təhlükədən qoruyacaq, həyatını nizam-intizamla keçirməsini təmin etmək üçün bir mənbəyə mütləq ehtiyac vardır.

Peyğəmbərlik sadəcə dünyəvi bilgi baxımından lüzumlu deyildir. Bəlkə də, insan dünyəvi baxımdan hiss etdiyi əksikliyi dini baxımdan qat-qat daha çox hiss edir. Çünki, insanın ağıl və duyğulardan başqa bilgi qaynağı yoxdur. Bunların ikisi də dini ehtiyacı qarşılama baxımından yetərsizdir. Dinin əsasını təşkil edən Allah, hissiyyatla bilinməz. Ağıl mütləq və mükəmməl bir bilgi mənbəyi deyildir. Bu baxımdan ağıl insanın yaradıcısına qarşı vəzifələrini və ibadət formasını təyin edə bilməz. Peyğəmbərlərlə bərabər dini, fəlsəfi, siyasi, hərbi, elmi və başqa şeylərdə müvəffəqiyyət əldə etmiş insanları, yaxud nəfsani arzuları tanrılaşdırmaq, bəzi zamanı və ya əşyanı uğurlu ya da uğursuz hesab etmək, atalara və ya qəbirlərə itaət etmək, ruh köçünə (tənasüh) inanmaq kimi formalarla ortaya çıxan xürafələr ancaq uca yaradıcının göndərəcəyi vəhylərin aydınlığında yox edilə bilər. Peyğəmbərlərdən uzaq qalan və ya yaşayan insanların xürafələrin tələsinə düşdüklərini və son dərəcə gülməli aqibətlərini görmək üçün tarixə nəzər salmaq kifayətdir.

## IV. PEYĞƏMBƏRLİYİN SÜBUTU

Bir peyğəmbərin peyğəmbər olduğunu sübut etmək üçün, ancaq şübhə olmayan qəti bir dəlilə ehtiyac vardır. Bu qəti dəlil, ya onun göstərdiyi möcüzəni müşahidə etmək, yaxud qətiyyət bildirən bir xəbəri ağılın dərk etməsiylə mümkindür. Günümüzdə bu dəlillər ancaq peyğəmbərimiz üçün mövcuddur. Peyğəmbərimizin başda Quran möcüzəsi olmaqla yanaşı bir çox möcüzəsi bizə mütəvatir olaraq gəlib çatmışdır. Onun peyğəmbərliyi bizə şübhə olmayan dəlillər vasitəsiylə gəlib çatdığı üçün, Onun, peyğəmbərliyini xəbər verdiyi hər kəsin, Allahın elçisi olduğunu mütləq qəbul edirik.

## A. Möcüzələr

Möcüzə, peyğəmbərlik iddiasında olan bir insanın, bu iddiasının doğru olduğunu isbat etmək üçün Allahın qüdrətiylə göstərməyə nail olduğu qeyri-adi bir şeydir. Bunlar o qədər qeyri-adi və ağıla sığmayan şeylərdir ki, başqa heç bir insanın bu şeyi etməsi mümkin deyildir. Peyğəmbərlərin möcüzəsi ümumiyyətlə insanların, "Bizə doğru söylədiyinə dair bir dəlil gətir" şəklindəki arzu və istəklərin xoşhal edilməsi üçün meydana gəlir.

a) Həqiqətdə möcüzə Allahın feilidir. "Peyğəmbərin möcüzəsi" deyilməsi məcazi mənada olub, möcüzənin peyğəmbər vasitəsiylə olması və ya onun doğruluğunu göstərməsi səbəbiylədir.

b) Möcüzə təbiət qanunlarının üstündə və ona zidd olan bir hadisədir.

c) Möcüzə, peyğəmbərlik vəzifəsi olan insanlar tərəfindən meydana gəlir.

d) Möcüzə, peyğəmbərlik iddiasından əvvəl olmaz. Bu iddiadan çox sonra da olmaz. Peyğəmbərlik davası ilə birlikdə olur.

e) Möcüzə olan hadisə, iddiaya və peyğəmbərin arzusuna uyğun olaraq meydana gəlir. "Dağı yerindən qaldıracam" deyən bir insanın dənizi yarması möcüzə deyildir.

f) Möcüzə, insanların bənzərini və bərabərini etməkdən aciz olduqları bir hadisə formasında olmalıdır.

## B. Fövqəladə Hadisələr

a) İrxas: Peyğəmbər olacaq insanın peyğəmbərliyindən əvvəl meydana gələn və o şəxsin peyğəmbər olaraq göndəriləcəyinə dəlalət edən xariqə hadisə və hallardır. Hz. İsanın beşikdə uşaq olduğu halda danışması buna misaldır.

b) Kəramət: Peyğəmbərə könüldən bağlı olan və ona tabe olan vəlilərdən meydana gələn hadisədir. Əslində bir vəlinin kəraməti tabe olduğu peyğəmbərin möcüzəsidir. Fövqəladəlik baxımından aralarında bir fərq yoxdur. Ancaq, möcüzə peyğəmbərdə, kəramət vəlidə meydana

gəlir. Möcüzədə peyğəmbərlik iddiası olduğu halda, kəramətdə elə bir şey yoxdur.

d) Məunət: Vəli olub olmadığı bilinməyən, "xalq arasında təmiz qəlbli, gözəl əxlaqlı bir müsəlman" olaraq bilinən və İslam hökmlərini lazımi şəkildə tətbiq edən şəxsdən zühur edən hadisədir.

e) İstidrac: Kafir və günahkar insanlardan arzu və istəklərinə uyğun olaraq meydana gələn fövqəladə hadisədir.

f) Xəyanət: kafir və günahkar insanlardan arzu və istəklərinə zidd olaraq meydana gələn hallardır. Yalançı peyğəmbərlərdən olan Müsəylimətül-Kəzzabın, bir gözü kor olan adamın, gözünü şəfa etmək məqsədilə dua etməsinə baxmayaraq, o adamın görən gözünün də kor olması buna misaldır.

## V. PEYĞƏMBƏRLƏRİN SAYI VƏ QURANDA ADI KEÇƏN PEYĞƏMBƏRLƏR

İlk peyğəmbər Hz. Adəmdən sonuncu peyğəmbər Hz. Məhəmmədə qədər bir çox peyğəmbər yaşamışdır. Allah Təala hər ümmətə bir peyğəmbər göndərmişdir. Göndərilən peyğəmbərlərin sayı haqqında Qurani-Kərimdə dəqiq bir rəqəm verilməmişdir. Hz. Peyğəmbərə bunların sayı soruşulmuş, O da 124 min (başqa bir rəvayətdə 224 min) olduğunu söyləmişdir. Ancaq Allah Təala bir ayədə: **"Biz səndən əvvəl də peyğəmbərlər göndərmişdik. Onlardan kimisi haqqında sənə xəbər vermiş, kimisi haqqında xəbər verməmişik"**[114]-deyə buyurduğu üçün peyğəmbərlərin sayı haqqında dəqiq bir rəqəm söyləməmək daha yaxşı olar. "Hz. Adəmdən Hz. Məhəmmədə qədər göndərilən bütün peyğəmbərlərə inandım. Onların haqq və doğru olduğunu təsdiq edirəm" demək lazımdır.

Qurani-Kərimdə adları keçən 25 peyğəmbər vardır. Bu peyğəmbərlərdən 18-i Ənam surəsindəki 83-86 ayələrində birlikdə zikr edilmişdir. Digər yeddi peyğəmbərin adları müxtəlif ayələrdə zikr edilmişdir:

114. əl-Mumin 40, 78.

**"Bu bizim İbrahimə öz tayfasına qarşı verdiyimiz dəlillərdir. Biz istədiyimiz kimsəni dərəcə-dərəcə yüksəldərik. Şübhəsiz ki, Rəbbin hikmət sahibi, elm sahibidir. Biz İshaqı və Yaqubu Ona əta etdik. Onların hər birini hidayətə çatdırdıq. Bundan əvvəl Nuhu və onun nəslindən olan Davudu, Süleymanı, Əyyubu, Yusifi, Musanı və Harunu da hidayətə qovuşdurmuşduq. Biz yaxşı iş görənləri belə mükafatlandırırıq. Zəkəriyyanı, Yəhyanı, İsanı, İlyası da. Onların hamısı əməlisalehlərdən idi. Biz, həmçinin İsmaili, Əlyəsəi, Yunisi və Lutu da hidayətə qovuşdurduq və onları aləmlərdən üstün tutduq."**[115]

**"Allah Adəmi, Nuhu, İbrahim övladını və İmran ailəsini aləmlər üzərində seçilmiş etdi."**[116]

**"Ad tayfasına da qardaşları Hudu peyğəmbər göndərdik"**[117]

**"Səmud qövmünə də qardaşları Salehi peyğəmbər göndərdik"**[118]

**"Mədyən əhlinə də qardaşları Şüeybi peyğəmbər göndərdik"**[119]

**"İsmaili, İdrisi və Zülkifli də yad et! Onların hər biri səbr edən kimsələrdən idi."**[120]

**"Məhəmməd aranızdakı kişilərdən heç birinizin atası deyildir. Lakin o, Allahın Rəsulu və peyğəmbərlərin sonuncusudur."**[121]

## VI. PEYĞƏMBƏRLƏRİN XÜSUSİYYƏTLƏRİ

Hər peyğəmbər, insan olmasına baxmayaraq insanlardan fərqli xüsusiyyətlərə malikdir. Bunlara peyğəmbərlər haqqında vacib olan sifətlər deyilir:

---

115. əl-Ənam 6, 83-86.
116. Ali-İmran 3, 33.
117. əl-Əraf 7, 65.
118. Hud 11, 61.
119. Hud 11, 84.
120. əl-Ənbiya 21, 85.
121. əl-Əhzab 33, 40.

**a) Sidq**: Doğru olmaq deməkdir. Hər peyğəmbər doğru danışan, dürüst insandır. Peyğəmbərlər əsla yalan danışmazlar. Sidqin ziddi olan Kizb(yalan danışmaq), peyğəmbərlər üçün əsla düşünülməyən bir sifətdir. Bütün peyğəmbərlər, peyğəmbərlikdən əvvəl və sonra həyatları boyunca yalan danışmamışdırlar. Quranda peyğəmbərlərin doğru olduqlarına dair ayələr vardır. Belə ki, Quranda: **"Kitabda İbrahimi də yad et! Həqiqətən, o, büsbütün doğru danışan kimsə- bir peyğəmbər idi"**[122]-deyə buyurulur.

**b) Əmanət**: Güvənilən deməkdir. Peyğəmbərlərin hamısı güvənilən, əmin insanlardır. Əmanətə əsla xəyanət etməzlər: **"Heç bir peyğəmbərə əmanətə xəyanət etmək yaraşmaz"**[123].

**c) İsmət**: Günah törətməkdən uzaq, günah işləməkdən qorunmuş olmaq deməkdir. Peyğəmbərlər, xüsusilə də peyğəmbərlikdən sonra günah iş görməzlər. Peyğəmbərlər insan olduqları üçün böyük günah dərəcəsində olmayan bəzi xətalar etsələr də, Allahın onlara etdiyi xəbərdarlıq nəticəsində bu xətadan uzaqlaşmışdırlar. Peyğəmbərlərin belə kiçik xətalarına zəllə deyilir. Peyğəmbərlərlərin günahdan qorunduqlarına və Allahın nəzarətində yetişdiklərinə dair ayələr vardır: **"Gözümün qabağında boya-başa çatdırılasan deyə, Öz tərəfimdən sənə bir sevgi yaratdım."**[124] **"Biz onları əmrimizlə doğru yolu göstərən imamlar etdik. Biz onlara xeyirli işlər görməyi, namaz qılmağı və zəkat verməyi vəhy etdik. Onlar yalnız Bizə ibadət edirdilər."**[125]

**d) Fətanət**: Peyğəmbərlərin ağıllı, zəkalı və uzaqgörənlik qabiliyyətinə malik olmaları deməkdir. Bunun ziddi olan axmaqlıq, peyğəmbərlər haqqında düşünülməyən sifətdir. Peyğəmbərlər ağıllı və zəkalı olmasalardı xitab etdikləri insanlara təsir edə bilməzdilər.

**e) Təbliğ**: Lüğətdə çatdırmaq, bildirmək deməkdir. Termin olaraq isə, peyğəmbərlərin Allah tərəfindən aldıqları əmr və qadağaları ümmətlərinə əksiksiz çatdırmaları deməkdir. Təbliğin ziddi olan "Kətm-gizləmək" onlar haqqında düşünülməzdir. Hər peyğəmbər aldığı bütün əmrləri hər bir hərfinə

---

122. Məryəm 19, 41.
123. Ali-İmran 3, 161.
124. Taha 20, 39.
125. əl-Ənbiya 21, 73.

qədər ümmətinə bildirmişdir. Əgər bildirməsəydilər əmanətə xainlik etmiş olardılar. Bir ayədə belə buyurulur: **“Ya Peyğəmbər! Rəbbin tərəfindən sənə nazil ediləni təbliğ et. Əgər bunu etməsən, risalətini yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyacaq. Həqiqətən, Allah kafir camaatı düz yola yönəltməz!”**[126]

Qadınlardan peyğəmbər olub-olmadığı ixtilaflıdır. Əşariyyə və Zahirilərə görə qadınlardan da peyğəmbər ola bilər. Belə ki, Qurani-Kərimdə Hz Musanın anasına vəhy edildiyini (Qəsəs 28, 7) və Hz Məryəmin peyğəmbər olaraq seçildiyini bildirən (Ali İmran 3, 42; Məryəm 19, 17) ayələr vardır. Qurani-Kərimdə də **“Ya Rəsulum! Biz səndən əvvəl də özlərinə vəhy etdiyimiz kişilərdən başqasını peyğəmbər göndərmədik”**[127]- deyə buyurularaq peyğəmbərlərin kişilərdən olduğu bəyan edilmişdir.

## VII. PEYĞƏMBƏRLƏRİN DƏRƏCƏLƏRİ

Biz peyğəmbərlərin hamısına inanırıq. Bəzilərinin peyğəmbərliyini qəbul edib, bəzisini də qəbul etməyərək aralarında fərq qoymuruq. Lakin, onların hamısının peyğəmbərliklərini təsdiq etdikdən sonra aralarında dərəcə fərqinin olduğunu qəbul edirik. Çünki, bu mövzu ilə əlaqədar olaraq Qurani-Kərimdə **“Bu peyğəmbərlərin bəzisini digərindən üstün etdik. Allah bunlardan bəzisi ilə danışmış, bəzisinin isə dərəcələrini yüksəltmişdir...”**[128]- deyə buyurulmuşdur. Ayədəki Allahın bir çox dərəcələrə yüksəltdiyi insandan məqsəd Peyğəmbərimiz Hz. Məhəmməddir. Belə ki, Peyğəmbərimizin digər peyğəmbərlərdən fərqli olan üstün və bənzərsiz xüsisiyyətləri vardır. Onun digər peyğəmbərlərdən fərqli olan yönlərini belə sıralamaq olar:

2.Peyğəmbərimiz yaradılanların ən böyüyü və Allahın ən sevdiyi quludur. Bir ayədə **“Siz insanlar üçün ortaya çıxarılmış ən yaxşı ümmətsiniz”**[129] deyə buyurulmuşdur. Bir cəmiyyətin ən xeyirli ümmət

126. əl-Maidə 5, 67.
127. əl-Ənbiya 21, 7.
128. əl-Bəqərə 2, 253.
129. Ali İmran 3, 110.

olması, o ümmətin tabe olduğu peyğəmbərin də ən üstün varlıq olmasını zəruri edir.

3. Hz. Məhəmmədin peyğəmbərliyi bütün məxluqata aiddir. Halbuki digər peyğəmbərlər müəyyən topluluqlar üçün göndərilmişdir. Bu mövzuda belə buyurulmuşdur: **“Biz səni bütün insanlara (möminlərə Cənnətlə) müjdə verən, (kafirləri isə Cəhənnəm əzabı ilə) qorxudan bir peyğəmbər olaraq göndərdik.”**[130]

4. Rəsuli Əkrəmin Peyğəmbərliyi qiyamətə qədər davam edəcəkdir. Halbuki daha əvvəlki peyğəmbərlərin nübüvvəti müvvəqəti bir zaman ərzinə aid idi.

5. Peyğəmbərimiz son peyğəmbərdir. Ondan sonra başqa bir peyğəmbərin gəlməyəcəyi bu ayədə açıq bir şəkildə ifadə edilmişdir: **“Məhəmməd aranızdakı kişilərdən heç birinizin atası deyildir. Lakin o, Allahın Rəsulu və peyğəmbərlərin sonuncusudur.”**[131]

6. Onun gətirdiyi din, ən son və ən mükəmməl bir dindir. İslamiyyət özündən əvvəlki bütün dinlərin hökmlərini ortadan qaldırmışdır. Qiyamətə qədər ən son və ən mükəmməl din olaraq davam edəcəkdir. Belə ki, bu barədə Qurani-Kərimdə belə buyurulur **“Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və sizin üçün din olaraq İslamı bəyənib seçdim..”**[132]

## VIII. AXIRINCI PEYĞƏMBƏR HZ. MƏHƏMMƏD (S.Ə.V)

Rəsul və ya nəbi deyə adlandırılan, insanlara və cinlərə göndərilən peyğəmbərin axırıncısı olan Hz. Məhəmməddir. Dünyaya gəlişindən vəfatına qədər bütün həyatı tarix səhifələrinə aşikar bir şəkildə yazılan Hz. Məhəmməd (s.ə.v), Ərəbistanın Məkkə şəhərində 571-ci ildə anadan olub. Atasının ölümündən sonra anadan olan peyğəmbər iki il himayəsində olduğu babası Əbdülmüttəlibi də itirdikdən sonra, əmisi Əbu Talibin yanında böyüyüb boya-başa çatdı. Uşaqlıq illərini Məkkədə çobanlıq

130. Səbə 34, 28.
131. Əhzab 33, 40.
132. Maidə 5, 3.

edərək keçirdi. Doqquz və ya on iki yaşlarında əmisi Əbu Taliblə bərabər ticarət karvanıyla Suriyəyə getdi. İyirmi yaşından sonra Məkkədə güvənilir (əmin) bir insan kimi tanındığı üçün Məkkənin zəngin tacirlərindən biri olan Əsəd qəbiləsindən olan Huveylidin qızı Xədicənin ticarət karvanını idarə etmək üzrə ikinci dəfə Suriyəyə getdi. İyirmi beş yaşında özündən böyük olan və iki dəfə evlənib dul qalan Xədicə ilə evləndi. Xədicədən altı uşağı dünyaya gəldi. Qırx yaşlarında daha əvvəl hiss etmədiyi bəzi ruhi təcrübələr yaşamağa başladı. Məkkədəki Hira dağındakı Sevr mağarasında inziva həyatı yaşamağa başladı. Daha əvvəllər yaşamadığı bu inziva həyatını davamlı olaraq yaşamağa başladı. Qırx yaşında Ramazan ayında yenə həmin mağarada inziva həyatı yaşarkən oraya insan cildində bir mələk gəldi və ona “Oxu” dedi. Peyğəmbər, “Mən oxumaq bilmirəm”-deyincə mələk onu qüvvətli sıxaraq ikinci dəfə “Oxu” dedi. Eyni hadisə üçüncü dəfə də təkrar olduğu zaman mələk ona **“Yoxdan yaradan Rəbbinin adı ilə oxu! O, insanı laxtalanmış qandan yaratdı. Oxu! Sənin Rəbbin ən böyük kərəm sahibidir! O Rəbbin ki, qələmlə (yazmağı) öyrətdi. İnsana bilmədiklərini öyrətdi.”**[133]-deyə buyuraraq ilk ayələri gətirdi. Beləcə ilahi vəhyə məzhər olan peyğəmbər, iyirmi üç il müddətində vəhy almağa davam edərək bütün insanlara və cinlərə peyğəmbər olaraq göndərildi.

Hz. Peyğəmbər ilk olaraq çoxu bütpərəst olan Məkkəliləri tövhid dininə dəvət etdi. Həqarət və təhdidlərə baxmayaraq qövmünü və ətraf mühitdəki insanları İslam dinini qəbul etməyə dəvət etdi. O, Məkkəli müşriklər tərəfindən öldürülmək istədiyini bildiyi zaman Mədinəyə hicrət etdi. O, insanları xürafələrdən uzaqlaşdırıb, insanları kainatın yaradıcısı olan Allaha inanıb qulluq etməyə çağıran, yaxşılığı əmr edib, pislikləri qadağan edən İslam dinini sürətlə Ərəbistana yaydı. Məkkə müşrikləri, yəhudi və xristianların müharibələr də daxil olmaqla etdikləri zülm və əziyyətlərə baxmayaraq Hz. Peyğəmbər risalət vəzifəsini müvəffəqiyyətlə yerinə yetirdi və son ilahi əmrləri özü tətbiq edərək 632-ci ildə Mədinədə vəfat etdi. Vəfatından sonra insanlara, təhlükələrdən qorunmaq məqsədilə iki mənbə buraxdı: Bunlardan biri təhrif edilməyən və qiyamətə qədər bizə rəhbər olacaq, eyni zamanda peyğəmbərliyin də ən güclü dəlili olan Qurani-Kərim, digəri isə onu açıqlayan və bizə Quranı daha gözəl anlamamıza köməklik edən sünnədir.

133. əl-Ələq 96, 1-5.

## IX. HZ. PEYĞƏMBƏRİN PEYĞƏMBƏRLİYİNƏ İMAN

Hz. Məhəmmədin peyğəmbər olduğuna iman etmənin fərz olduğunu bildirən ayə və hədislərin var olduğunu bilmək lazımdır. Qurani-Kərimdə Hz. Məhəmmədin peyğəmbər olduğu açıq bir şəkildə bildirilmiş,[134] buna iman etmək əmr edilmiş,[135] Allahın elçisinə iman etməyənlər də kafir olaraq adlandırılmışdır.[136] Hədislərdə də, Hz. Məhəmmədin peyğəmbər olduğu bildirilmiş və Onun peyğəmbərliyini qəbul etməyənin mömin olmadığı bildirilmişdir. Qurani-Kərimdə və hədislərdə Hz. Məhəmmədin peyğəmbər olduğunu bildirən mətinlər həm məna baxımından çox açıqdır, həm də say etibarıyla olduqca çoxdur. Bu mətinləri diqqətə alaraq nəql baxımından onun peyğəmbərliyini təsdiq etməmək mümkin deyil. Bu mövzudakı nəqli dəlillər qəti olub, şübhə və etiraza səbəb olmayacaq qədər açıqdır.

## X. NÜBÜVVƏTİN BEYNƏLMİLƏL OLMASI

Sonuncu peyğəmbər Hz. Məhəmmədin nübüvvətinə iman etmənin ünsürlərindən biri, onun peyğəmbərliyinin beynəlmiləl olduğunu bilməkdir. Qurani-Kərimin ifadəsinə görə Hz. Məhəmməd, bütün insanlara haqq din ilə göndərilən həqiqi və ümmi bir peyğəmbərdir. Ancaq insanların çoxu bunu bilməzlər. Bu və buna bənzər ayələrdə keçən “Ey insanlar” ifadəsindən sadəcə Hz. Peyğəmbərin ilk muxatabı olan müşrik Ərəblər qəsd edilmir. Çünki, başqa ayələrdə də, Hz. Peyğəmbərin aləmləri xəbərdar edən bir peyğəmbər olduğu bildirilmiş, müşriklər istəsə də, istəməsə də Allah tərəfindən elçi olaraq göndərildiyi bəyan edilmiş, kitab əhli olan yəhudilərlə xristianlara da onun peyğəmbərliyini təsdiq etmələri əmr edilmiş, ona iman etməyən əhli kitab tənqid edilmiş və kafir olduqları bildirilmişdir.

Bu açıq ayələr Hz. Peyğəmbərin xüsusi bir millətə, irqə və bölgəyə deyil, bütün insanlara göndərilmiş beynəlmiləl bir peyğəmbər olduğuna sübutdur.

134. Məhəmməd 65, 29; əl-Əhzab 33, 45; Yasin 36, 3.

135. əl-Hədid 57, 7-8; ət-Təğabün 64, 8.

136. əl-Fəth 48, 13.

## XI. NÜBÜVVƏTİN DƏLİLLƏRİ

### A. Qurani-Kərim

Hər peyğəmbər kimi Hz. Peyğəmbər də Allahın göndərdiyi bir elçi olduğunu və insanları gətirdiyi vəhylərə iman etməyə dəvət edincə cəmiyyətin aristokrat insanları tərəfindən dəli, sehrbaz və s kimi ittihamlara məruz qalmış, ondan peyğəmbər olduğunu təsdiqləyən hissi möcizələr göstərməsini istəmişdirlər. Qurani-Kərimdə bildirildiyi kimi, inkar edənlər göydən bir kitab endirilməsini, üzüm və xurma bağlarından meydana gələn və ulduzlu saraylara sahib olmasını Hz Peyğəmbərdən tələb etmişdirlər. Hz Peyğəmbərə bu möcüzələr verilmiş olsaydı inkar edənlər yenə onu yalanlayacaq və inanmaq istəməyənlərə bu möcüzələrin bir faydası olmayacaqdır. Hz Məhəmmədin insanlara göndərilən axırıncı Peyğəmbər olması, özündən sonra gələcək bütün insanlara xitab edən bir möcizə göstərməsi lazım idi. Bu səbəblə Hz. Peyğəmbərə nübüvvətini sübut edən ən böyük möcüzə olaraq Qurani-Kərim verilmiş və başqa möcüzə axtarmağa ehtiyac hiss etmədən Quranın yetərli bir dəlil olduğu bildirilmişdir. Quranın möcüzə olması müxtəlif yönlərdən izah edilə bilər.

**a) Quranın Ümmi Bir İnsanın Tərəfindən Meydana Gəlməsi**

Hz Məhəmmədin həqiqi Peyğəmbər olduğunu göstərən güclü bir dəlil olaraq onun ümmi, yəni oxuma və yazma bilmədiyi halda kainatla bərabər, xüsusilə insanı maraqlandıran mövzularda doğru məlumatlar ehtiva edən əsrlərə həkk edən uca bir kitab gətirməsidir. Bütün insanları və cinləri kömək etmələri üçün bir araya toplasalar Quranın bənzərini meydana gətirə bilməzlər. Hz. Peyğəmbərin qırx yaşına qədər oxuma və yazma bilmədiyi Qureyşlilərin etiraz etmədən qəbul etdiyi xüsusdur. Əgər oxuma və yazma bilsəydi xitab etdiyi insanlar bunu diqqətə alaraq yalandan bir şey bəyan etdiyini söylər və heç kim ona iman etməzdi. Halbu ki, onun yalan danışmayan və güvənilən biri olduğunu bütün Qureyşlilər qəbul etmişdir. Tarixi rəvayətlər bunu təsdiq etməkdədir. İnsan ağlı oxuma və yazma bilməyən bir insanın, insanı və kainatı maraqlandıran mühim mövzular haqqında əlçatmaz kitab bir yana adi bir kitab belə yaza bilməyəcəyini hökm edir. Ümmi bir cəmiyyət içində yetişən və özü də ümmi olan Hz. Peyğəmbər, Quran kimi ləfzi gözəl, yüksək elm və məlumatlara sahib olan

bir kitab gətirdiyinə görə bunu, insanı və kainatı ən incəliklərinə qədər bilən və yaradan bir mənbədən almış olmalıdır. Bu mənbə də hər şeyə qadir olan, qüdrəti ilə insanı və kainatı yaradan Allahdır. Qurani-Kərimi bir insanın yazması mümkin olsaydı həm insanların yerdəki və göydəki sirləri bilməsi, həm də buna bağlı olaraq ləfz və bilgi yönündən Quranın bənzəri olan bir kitab yazmaları lazım idi. Belə ki, Qurani-Kərim ilahi bir kitab olmadığını iddia edənlərə meydan oxuyaraq bir bənzərinin meydana gətirilməsini istəmiş,[137] ancaq aradan 1400 ilə yaxın bir müddət keçsə də insanlar buna müvəffəq olmamışdırlar. Bu da, Qurani-Kərimin Allah tərəfindən Hz. Peyğəmbərə vəhy edilmiş ilahi bir kitab olduğunu açıq bir şəkildə sübut edir.

**b) Qurandakı möhtəvanın bir-biriylə olan ziddiyyətsizliyi**

Quranın ilahi bir kitab olduğunu təsdiq edən əsaslardan biri də, onun mətnində ziddiyyətsizliyin olmasıdır. Bu ilahi kitab az-az gələn vəhylərlə iyirmi üç il ərzində tamamlanmışdır. Yeni nazil olan ayələrin yerlərini Hz. Peyğəmbər vəhy katiblərinə bildirməklə Qurani-Kərim yazılaraq tamamlanmışdır. Buna baxmayaraq ayələr arasında heç bir ziddiyyət yoxdur. Əksinə, bir-birini tamamlamışdır. Belə ki, insanın bu qədər qarışıq mövzularda ziddiyyətdən uzaq olması, insan və kainat haqqında verilən məlumatların həqiqətə uyğun olması və bu zamana qədər qorunub saxlanması buna nümunədir.

**c) Quranın Qeybə Dair Xəbərlər Verməsi**

İnsanların etiqadi, hüquqi, əxlaqi, siyasi və sosial baxımdan hökmlər çıxarıb ibrət almaları məqsədilə Quranda yer verilən tarixi hadisələrlə yanaşı peyğəmbər qissələri onun ilahi bir kitab olduğunun bir başqa sübutudur. Hz. Musa ilə Firon, Hz. Məryəm və Hz. İsa ilə onların qövmləri, Hz. Yusif ilə qardaşları arasında baş verən hadisələr Hz. Peyğəmbərin ümmi bir insan olaraq həqiqəti bilməsi mümkin deyil. Yəhudilərin böyük alimlərindən olan Abdullah b. Səlamın Hz. Peyğəmbərə soruşduğu bəzi suallar və bu suallara verilən cavablardan sonra müsəlman olması bu cavabların ancaq vəhy yolu ilə bilinəcəyini dərk etməsindən ibarətdir.

Bizansın İranı müharibədə məğlub edəcəyi, Qurani-Kərimin təhrif olmadan qiyamətə qədər qorunacağı və Hz. Peyğəmbərin düşmənlərinə

137. əl-Furqan 25, 5.

qarşı mühafizə ediləcəyinə dair xəbərlər bunlara aiddir.[138] Qeybi insanların bilməsi imkansız olduğuna görə, buna aid olan xəbərləri ehtiva edən Quran Allah tərəfindən endirilmiş bir kitabdır.

**d) Quranın yaradılışla əlaqəli mövzulardan bəhs etməsi**

Qurani-Kərim, insanı Allahın varlığına və birliyinə inanmağa dəvət edərkən təbiətdəki nizam-intizamı ağıl ilə düşünməyə təşviq etməkdədir. Qurani-Kərim insanın, kişinin sperması ilə qadının yumurtasından yaradılan mükəmməl bir insan halına gəlməsi, yer kürəsinin pozulmadan və ləngimədən canlıların yaşaması üçün əlverişli bir şəkildə varlığını davam etdirməsi, dağlar, meşələr, dənizlər, çaylar, ay, günəş və ulduzların tabe olduğu qanunlara, küləyin əsməsi, yağışın yağması, bitkilərin canlanması, bütün varlıqların dişi və erkək olması kimi mövzulara da təmas edib, bunlar haqqında maraqlı məlumatlar vermişdir. Quranda bəhs edilən və elmin əsrimizdə kəşf etdiyi bu məlumatların Quranda var olması nəinki ümmi bir insan tərəfindən, hətta elmi cəhətdən bütün imkanlara sahib olan bir insanın belə bu məlumatları miladi altı yüzüncü illərdə bilməsinin imkansız olduğuna şübhə yoxdur. Nəticə etibarıyla bunu ifadə etmək mümkündür ki, Quran, ümmi bir insana aid deyil, insan da daxil olmaqla kainatın yaradılışını nizamlayan Allaha aid bir kitabdır.

**e) Quranın bəşəri bilgiləri ehtiva etməsi**

İnsanlara peyğəmbərlərin göndərilməsinin məqsədi onları dünya və axirət səadətinə çatdırmaq üçündür. Qurani-Kərimdə bu mövzuda: **“Həqiqətən, bu Quran bütün bəşəriyyəti ən doğru yola (İslama) yönəldir”**[139]deyə bildirilərək onun insanlar üçün dini, sosial, hüquqi və əxlaqi mövzularda nə qədər əhəmiyyətli bir mənbə olduğunu bəyan etmişdir. Belə ki, insanların fərd və cəmiyyət olaraq səadət və xoşbəxtliklərini təmin etməklərini ilahi bir rəhbərlik olmadan ağılla dərk edilməsi olduqca çətindir. Bu baxımdan Quran, pisliklərdən çəkindirən və yaxşılığı əmr edən bilgilər ilə davranışları izah etmişdir.[140]

138. ər-Rum 30, 2; əl-Hicr 15, 9; əl-Maidə 5, 67; Sad 38, 67-70.

139. əl-İsra 17, 9.

140. əl-Cümə 62, 2; əl-Qələm 68, 1-4; Loğman 31, 2.

### B. Hz. Peyğəmbərin Keçmiş İlahi Kitablarda Müjdələnməsi

Bəşariün-Nübüvvə adıyla da ifadə edilən bu dəlilin özəyi budur: keçmiş ilahi kitablarda Hz Məhəmməddin nübüvvətini müjdələyən və onun həqiqi bir peyğəmbər olaraq insanlara göndəriləcəyini xəbər verən ifadələr mövcuddur. Hz Peyğəmbər, peyğəmbərliklə vəzifələndirilib insanları gətirdiyi kitaba iman etməyə dəvət etdiyi zaman Əhli kitabın alimlərindən bəziləri oğullarını tanıdıqları kimi onu tanıyıb səcdə etmiş,[141] Yəhudi alimləri peyğəmbərliyinə şahidlik edib müsəlman olmuş,[142] bəzi xristian alimləri ağlamış və Quran ilahi bir vəhy, təbliğçisinin də həqiqi bir peyğəmbər olduğuna şahidlik edərək iman etmişdirlər.[143] Çünki, Hz Musa Tövratda, Hz İsa da İncildə adı, vəsfləri və gətirəcəyi ismarıclarla bərabər əshabına aid xüsusiyyətləriylə birlikdə Hz Peyğəmbərin gələcəyini ümmətlərinə müjdələmişdirlər.[144]

Tövrat və İncildə Hz Məhəmmədin peyğəmbərliyi ilə əlaqədar xəbərlər olmasaydı həm Əhli kitab alimlərindən bəziləri əsla ona inanmaz, həm də Quranda bu xüsuslardan bəhs edilməsi bir məna ifadə etməzdi.

Ən qədim dövrlərdən etibarən bütün dinlərdə “bir qurtarıcının gələcəyi müjdəsi” verilmişdir. Belə ki, Zərdüşt dininin müqəddəs kitabı Zend-Avestada “aləmlərə rəhmət mənası ifadə edən” Saoşyant adında birinin insanlara rəhbər olaraq gələcəyi və bütləri qıracağı bildirilmişdir. Hind müqəddəs kitablarında Vədalar və Püranalarda “Təriflənmiş” (Məhəmməd) adlı bir insanın peyda olacağı, maşınının göylərə çıxacağı (mirac) və böyük zəfərlərindən birinin üç yüz (Bədr savaşı), digərinin isə on min insanla (Məkkənin fəthi) qazanacağını, atasının “Allahın qulu” yəni (Abdullah), anasının da “əmin” (yəni Aminə) adını daşıyacağı zikr edilmişdir. Buddizmin qurucusu Buda da, mərhəmət, rəhmət və sevgi mənasına gələn Maitreya adında birinin zühur edəcəyini və başlatdığı işi tamamlayacağını bildirmişdir. Bunların hamısı Hz Peyğəmbərin keçmiş müqəddəs kitablarda müjdələndiyini və onun həqiqi bir peyğəmbər olduğunu təsdiq edən mühim dəlillərdir.

141. əl-Bəqərə 2, 146; əl-Ənam 6, 20.
142. əl-Əhqaf 46, 10.
143. əl-Maidə 5, 83
144. əs-Saff 61, 6; əl-Əraf 7, 157.

### C. Hz Peyğəmbərin uca əxlaqı

Peyğəmbərliklə vəzifələndirilmədən əvvəl və nübüvvətlə vəzifələndirildikdən sonrakı həyatının bütün mərhələlərində Hz Peyğəmbərin, hər kəsə yaxşılıq edən, möhtaclara və imkansızlara yardım edən, fəqirləri qoruyan, məişətini işləyərək təmin edən, dünya malına meyl etməyən, əlindəki malı insanlar üçün səxavətlə xərcləyən, yalan danışmayan, heç kimə pislik etməyən, özünə edilən pisliyi bağışlayan, hər mövzuda etibar edilən, Quranda "**Şübhəsiz ki, sən böyük bir əxlaq üzərindəsən!**"[145]-deyə buyurularaq mükəmməl bir insan olduğu siyər, hədis və tarix kitablarından bilinən bir həqiqətdir. Çünki insan, hər zaman nəfsani arzularının və bunlara təşviq edən şeytanın hiylələrinin təsirindən xilas olmadığı kimi, dünya malına, firavanlığa və israfa düşkün olduğu bilinən bir həqiqətdir.

Ona vəd edilən hər cür maddi və mənəvi imkanları rədd etməsi və ölümü gözə alaraq peyğəmbərlik vəzifəsindən dönməməsi, Hz Peyğəmbərin ən uca əxlaqı şəxsiyyətində cəmləşdirməsi və bütün həyatı boyunca hər şeyin azı ilə yetinməsi onun bir peyğəmbər olduğunun açıq bir dəlilidir. Bundan əlavə bu insanın hər cür əxlaqsızlığın, zülmün, haqsızlığın, batil inancların hökm sürdüyü, dünya malı uğrunda insanların öldürüldüyü bir mühitdə yetişməsi də buna dəlildir.

### D. Hz Peyğəmbərin möcüzələri

Hz Peyğəmbərə verilən ən böyük və qalıcı möcizənin, ifadə gözəlliyindən də əlavə olaraq möhtəva etibarilə "əlçatmaz bir bilgi möcüzəsi" deyə ifadə edəcəyimiz Qurani-Kərim olduğu haqqında ixtilaf yoxdur. İnsanlar, elçiliklə vəzifələndirildiyini təsdiqləmək üçün ondan bəzi möcüzələr gözləmişdirlər. Ancaq inkar edənlərin Hz Peyğəmbərdən göstərməsini təklif etdikləri möcüzələr ona inanmaq və həqiqi peyğəmbər olduğunu kəşf etmək olmadığı üçün Allah Təala tərəfindən rədd edilmişdir.

Az yeməyi artırması, barmaqlarından su axması, üzərində xütbə oxuduğu kötüyün zarıması kimi möcüzələrin hər birini dəqiqləşdirmək mümkin olmasa da bu cür rəvayətlərin hamısını diqqətə alaraq Hz

145. əl-Qələm 68, 4.

Peyğəmbərdən bəzi hissi və ya xəbəri möcizələrin meydana gəldiyini söyləmək olar.

## XII. HZ.MƏHƏMMƏDİN AXIRINCI PEYĞƏMBƏR OLMASI

Qurani-Kərimdə Hz Peyğəmbərin Allahın rəsulu və nəbilərin sonuncusu olduğu açıq bir şəkildə bəyan edilmişdir.[146] "Nəbilərin axırıncısı" deyə adlandırılması rəsul ismini mələklər üçün də istifadə edilməsi baxımındandır. Əgər onun üçün "rəsulların axırıncısı" deyilmiş olsaydı mələklər Allahın rəsulları olmağa davam etdikləri üçün bu ifadə həqiqətə uyğun olmazdı. Bu baxımdan nəbilərin sona çatdığını, ancaq Allahın insanlardan rəsul göndərməyə davam edəcəyi tərzində müxtəlif qruplar tərəfindən ortaya atılan fikir və iddialar mənasızdır, həqiqətə uyğun deyildir.

Hədislər də Hz Məhəmmədin peyğəmbərlərin sonuncusu olduğunu, nübüvvət və risalətin özündən sonra sona çatdığını, özündən sonra nə nəbi nə də rəsulun gəlməyəcəyini qətiyyətlə ifadə etmişdir.[147]

Belə ki, nəbi ilə birlikdə peyğəmbərliyin sona çatdığını və bu qapının tamamilə bağlandığını bildirən ayə və hədislər çox açıq mənalar ifadə edib, yorumlanmağa əlverişli deyildir. Hz Peyğəmbərin Allahın rəsulu olub nəbilərin axırıncısı olduğunu,[148] dinin tamamlandığını, insanlar üçün din olaraq sadəcə islamın qəbul ediləcəyini,[149] İslamdan başqa bir din ardınca gedənlərin axirətdə zərər çəkənlərdən olacağı,[150] Quranın təhrif edilməkdən qorunacağı,[151] Hz Məhəmmədin bütün aləmlərə peyğəmbər olaraq göndərildiyini[152] bəyan edən ayələr bu mövzuda qətiyyət bildirən nəqli dəlillərdir.

146. əl-Əhzab 33, 40, 45-47; əl-Fəth 48, 29.
147. Müsnəd, II, 412, III, 267; Buxari, "Mənaqib" 18; Müslim, "Məsacid", 5; "İman", 327.
148. əl-Əhzab 33, 40.
149. əl-Maidə 5, 3.
150. Ali-İmran 3, 85.
151. əl-Hicr 15,9.
152. əl-Ənam 6, 19; əl-Araf 7, 158; əl-Furkan 25, 1; Səbə 34, 28.

İslamiyyətin başlanğıcından günümüzə qədər keçən tarix də Hz Məhəmmədin son peyğəmbər olduğunu təsdiqləmişdir. Çünki, bu müddət ərzində istər müsəlmanlar istərsə də qeyri müslimlər arasından heç bir peyğəmbərin zühur etməməsi bunu göstərməkdədir. Müxtəlif zamanlarda peyğəmbərlik iddia edənlər olsa da, bu həqiqəti dəyişdirməz. Belə ki, peyğəmbər olduqlarını iddia edənlər bu iddialarını əsaslandıra bilməmişdirlər.

## I. KİTABLARA İMAN

Kitablara iman, Allah Təala tərəfindən bəzi peyğəmbərlərə endirilən kitablara və bu kitablarda olan hər şeyin doğru və haqq olduğunu qəbul etmək, inanmaq deməkdir. Bir insan, Allahın peyğəmbərinə endirdiyi kitablara iman etməzsə, müsəlman olmaz. Bu kitabların bir qismi tamamilə yox olmuş, əlimizdə onlardan əsər əlamət qalmamışdır.(İbrahim və Musanın (ə.s) səhifələri kimi) Bir qismi də əlimizdə olmasına baxmayaraq pozulmuş, ilahi kitab olma xüsusiyyətini itirmişdir. (Tövrat, Zəbur və İncil kimi) Bir qismi də Allahın vəhy etdiyi şəkildə, orijinallığını qorumuş, heç bir təhrifə məruz qalmadan günümüzə qədər gəlib çatmışdır. (Qurani-Kərim kimi) Biz pozulmuş və dəyişdirilmiş (təhrif və təbdil) olan kitabların indiki vəziyyətinə və şəklinə deyil, Allahdan gələn və pozulmayan ilk şəklinə inanırıq.

## II. MÜQƏDDƏS KİTABLAR

İlahi və müqəddəs kitabların, Allahın kəlamı olmaları baxımından aralarında heç bir fərq yoxdur. Ancaq bəzi kitabların həcmi digər kitablara görə daha kiçikdir və onlar, səyfələr və risalələr halındadır. Digər kitablar isə daha böyük və kitab şəklindədir.

### A. Sühüf (Səhifələr)

Sühüf, səhifə kəlməsinin cəmidir. Dar bir ətraf mühitdə, kiçik topluluqlara, ehtiyaclarını qarşılayacaq və cavab verəcək şəkildə endirilən bir neçə səifədən ibarət olan risalələrə və ilahi kitablara sühüf adı verilir. Qurani-Kərimdə Hz İbrahim və Musaya nazil olan səhifələrdən bəhs edən iki ayə vardır: **“Yoxsa ona Musanın səhifələrində olanlar xəbər verilmədimi?!**

**Və çox vəfalı olan İbrahimin (sühüfündəkilər bildirilmədi?!)”**[153] **“Günahlardan təmizlənən kimsə isə nicat tapacaqdır. O kimsə ki, Rəbbinin adını zikr edib namaz qılar! Lakin siz dünyanı üstün tutursunuz! Halbuki axirət daha xeyirli və daha baqidir. Həqiqətən, bu deyilənlər Qurandan əvvəlki kitablarda mövcuddur-İbrahimin və Musanın kitablarında!”**[154]

Ayədə zikr edilən Musanın səhifələri, Tövratdan əvvəl Musaya (ə.s) endirilmiş olan kiçik səhifələrdir. Əbu Zərrdən rəvayət edilən zəif bir hədisə görə, Allah Təala yüz səhifə endirmiş, bunların 50 səifəsi Şitə (ə.s), 30 səifəsi İdrisə (ə.s), 10 səifəsi İbrahimə (ə.s) və 10 səifəsi də Musaya (ə.s) endirilmişdir. Hz. İbrahim və Musaya (ə.s) verilən səhifələr xaricində, Quranda bu mütəvatir hədisə aid qəti bir dəlil yoxdur.

**B. Tövrat**

Bu Hz. Musaya endirilən kitabın adıdır. Tövratın əslinin Allah kəlamı olduğuna və peyğəmbərinə enən müqəddəs bir kitab olduğuna inanmaq hər müsəlmana fərzdir, bunu inkar etmək insanı küfrə aparar. Çünki, Qurani-Kərimdə Tövratın Allahın müqəddəs kitablarından biri olduğu bildirilmişdir:

**“Şübhəsiz ki, Tövratı Biz nazil etdik. Onda haqq yol və nur vardır. Allaha təslim olan peyğəmbərlər yəhudilər arasında onunla, din alimləri və fəqihlər isə kitabdan qorunub saxlanılanlarla hökm edərdilər. Onlar ona (Tövratın ilahi bir kitab olmasına) şahiddirlər. İnsanlardan qorxmayın, Məndən qorxun**”[155]

Bu gün əlimizdə pozulmamış bir nüsxəsi olmayan Tövrata, Əhdi Atiq, Əhdi Qədim də deyilir. Bu gün əlimizdə Tövratın üç məşhur nüsxəsi vardır.

1. Yəhudulər və Protestanların qəbul etdikləri ibranicə olan nüsxə.

2. Katoliklər və Ortadoqslar tərəfindən qəbul edilən yunanca nüsxə.

153. ən-Nəcm 53, 36-37.

154. əl-Əla 87, 14-19.

155. əl-Maidə 5, 44.

3. Samilərcə qəbul edilmiş olan Samiricə nüsxə.

Bunlar Tövratın ən məşhur nüsxələri olmaqla yanaşı aralarında olduqca çoxlu ziddiyyətlər mövcuddur.

### C. Zəbur

Hz Davuda endirilmişdir. Bu mövzuda Qurani-Kərimdə belə buyurulur: **"Davuda Zəbur verdik"**[156] Məlum olduğu kimi Zəbur, ilahi kitabların ən balacasıdır və yeni dini hökmlər gətirməmişdir. Bu gün əldə mövcud olan Zəbur, lirik ifadə tərzi və ilahilərdən ibarət olub Allaha tərif, hikmətli sözlər və nəsihətlərdən meydana gəlmişdir.

### D. İncil

İncil Hz İsaya endirilmişdir. Bu mövzuda Qurani-Kərimdə belə buyurulur: "**Onların ardınca Məryəm oğlu İsanı özündən qabaqkı Tövratı təsdiqləyici olaraq göndərdik. Ona içində haqq yolu və nur olan, özündən əvvəlki Tövratı təsdiq edən, müttəqilər üçün doğru yol və nəsihət olan İncili verdik.**"[157] İncilə, Allah Təaladan Hz İsaya endirildiyi formada inanmaq, kitablara imanın əsaslarından biridir. Ancaq bu gün, İncilin əsli də Tövrat və Zəbur kimi əldə yoxdur. Pozulmuş və insanlar tərəfindən yazılmış olan şəkli vardır. İncilə Əhdi Cədid (Yeni Əhd) də deyilir.

Xristianlığın ilk zamanlarında bir-biri ilə düz gəlməyən yüzlərcə İncil var idi. Hər qrup və cəmiyyətin özünə xas bir İncili var idi. Bu baxımdan xristianlıq aləmində böyük münaqişələr və ixtilaflar meydana gəldi. Bunun üzərinə Bizans imperatoru Konstantin miladi 325 ci ildə xristian inanclarını təsbit etmək üçün bir ruhani məclis topladı. Minə yaxın insanın toplandığı bu məclisdə, bu günki dörd incil qəbul edildi və hamısına birdən Əhdi Cədid adı verildi. Bu gün dünyada məşhur olan incillər bunlardır:

**1. Matta İncili**: Matta havarilərdən biridir. O, İncilini İbranicə və ya Süryanicə yazmışdır. Ancaq bu nüsxənin əsli yox olmuş, tərcüməsi olduğu

156. əl-İsra 17, 55.

157 əl-Maidə 5, 46.

ehtimal olunan Yunanca yazılmış şəkli meydana çıxmışdır. 28 babdan meydana gəlmişdir. Hz İsanın məsih olmağından və əsli-nəsəbindən bəhs edir.

2. **Markos İncili**: Markos, havarilərin rəisi Petrosun tələbəsidir. Kitabın yazıldığı tarix və yazıçısı qəti olaraq bilinməməkdədir. 16 babdır. Hz İsanın həyatını çox sadə bir dillə anladan bu əsər, ayrıca yəhudi adətlərindən də bəhs edər.

**3. Luka İncili**: Əsərin yazıçısı Luka havari deyildir. 24 babdır. Hz İsanın həyatı və öyrətdiyi xüsuslardan bəhs edir.

**4. Yuhanna İncili**: Yazıçısının həvari olduğu rəvayət edilir. Əsər 24 babdan ibarətdir. İsanın Allahın oğlu olduğu görüşünü israrla mənimsəyir.

**5. Bernaba İncili**: Yuxarıda bəhs etdiyimiz dörd İncildən başqa, xristian aləmində gizli tutulan və oxunması qadağan edilən başqa bir İncil də vardır ki, buna Bernaba İncili deyilir. Bernaba, İsanın havarilərindən olub markosun əmisi oğludur. Bu incil V əsrdə oxunması qadağan olunan kitablar arasında yer almışdır. Bu əsər bu gün Miyana kitabxanasındadır. İngilis, Alman və Ərəb dilinə tərcümə edilən bu İncilin xüsusiyyəti, Qurana çox yaxın olması və Peyğəmbərimizin gələcəyini müjdələməsidir.

### E. Qurani-Kərim

Müqəddəs kitabların axırıncısı olan Qurani-Kərim, bizim peyğəmbərimiz Məhəmmədə (s.ə.v) endirilmiş, Peyğəmbərimizdən də bizə təvatür yolu ilə gəlmiş, heç bir pozulma və dəyişməyə məruz qalmamışdır. Bir ayədə Allahu Təala: “**Şübhəsiz ki, Quranı biz nazil etdik və sözsüz ki, Biz də onu qoruyub saxlayacağıq!**”[158]-deyə buyurur.

Qurani-Kərimə “QURAN” ismi Allah tərəfindən verilmişdir. Qurani-Kərimdə Allah Təala buyurur: “**Bu çox qiymətli Qurandır.**”[159] Qurani-Kərim özündən əvvəlki kitabları təsdiq etmiş, lakin onların qoyduğu hökmləri ortadan qaldıraraq yeni hökmlər gətirmişdir. Bu mövzu ilə əlaqədar olaraq Allah Təala Qurani-Kərimdə belə buyurur: “**Allahdan başqa heç bir tanrı**

158. əl-Hicr 15, 9.

159. əl-Vaqiə 56, 77.

**yoxdur. Əzəli, əbədi varlıq odur. Sənə özündən əvvəlkiləri təsdiq edən Kitabı (Quranı) haqq olaraq O nazil etdi. Tövratı da, İncili də O endirdi. Daha öncə insanları hidayət etmək üçün Furqanı da O nazil etdi. Allahın ayələrini inkar edənlər şiddətli əzaba düçar olacaqlar. Allah yenilməz qüvvət sahibi, intiqam sahibidir!**"[160]

## III. ƏVVƏLKİ MÜQƏDDƏS KİTABLARIN POZULMASININ SƏBƏBLƏRİ VƏ POZULDUĞUNUN DƏLİLLƏRİ

### A. Müqəddəs Kitabların Pozulmasının səbəbləri

1. Qurani-Kərim, 23 il müddətində fəsil-fəsil nazil olduğu üçün əzbərləmək asan olurdu. Hər dövrdə yüz minə yaxın hafiz tərəfindən əzbərlənirdi. Halbuki digər müqəddəs kitablar birdən nazil olduğu üçün onu əzbərləyənlər ya heç yox idi və ya bir neçə nəfərdən artıq deyildi. Bu baxımdan o kitabların pozulması və təhrif olması təbii idi.

2. Bu müqəddəs kitabların nazil olduğu topluluqlar onları üzündən oxuya biləcək səviyyədə elmi dərəcəyə malik deyildirlər. Əlavə olaraq bu kitabların nüsxəsi çoxaldılmadığı üçün bu kitabların sayı az idi. Halbuki müsəlmanlar Quranı öyrənməyə, əzbərləməyə və müxtəlif maddələr üzərinə yazmağa səy göstərirdilər.

3. Xüsusiylə İsrailoğullarının qarşılaşdıqları əsrlik, köç, düşmən istilası və başqa müsibətlər onların inanc əsaslarını və bu əsasların yazılı olduğu müqəddəs kitablarını qoruya bilməmələrinə səbəb olmuşdur.

4. Yəhudi və Xristian din adamlarının xoşuna gəlməyən yerləri müqəddəs kitablardan çıxartmaları və ya istədikləri kimi dəyişdirmələri də bu kitabların pozulmasının bir başqa səbəbidir. Belə ki, bu barədə Qurani-Kərimdə belə buyurulur: "**Ey möminlər! İndi onların (Yəhudilərin) sizə inanacaqlarına ümidmi edirsiniz? Halbuki onların içərisindən elələri vardır ki, Allahın kəlamını (Tövratı) dinləyib anladıqdan sonra, onu**

160. Ali-İmran 3, 2-4.

**bilə-bilə təhrif edirlər.**”[161] “**Yəhudilərin bir qismi (Tövratdakı) sözlərin yerini dəyişib təhrif edir...**”[162]

5. Allah Təalanın Qurani-Kərim haqqında **“Şübhəsiz ki, Quranı Biz nazil etdik və sözsüz ki, Biz də onu qoruyub saxlayacağıq**”[163]-deyə vəd etdiyi təminatı digər müqəddəs kitablar haqqında vəd etməmişdir. Bu da onların pozulmasının və təhrif edilməsinin bir başqa səbəbidir.

### B. Müqəddəs Kitabların Pozulduğunun Dəlilləri

1. Müqəddəs kitablardakı nüsxələr arasında fərq vardır. Misal olaraq, Hz Adəmdən Nuh tufanına qədər keçən zaman müddəti Tövratın İbranicə nüsxəsində 1650 il, Yunanca nüsxədə 2260 il, Samiricə nüsxədə isə 1307 il olaraq qeyd edilmişdir.

2. Əlimizdəki müqəddəs kitabların heç birində ilahi kitablara yaraşan bir dil yoxdur. Onların insan əlindən çıxdığı açıq bir şəkildə görünməkdədir. Misal olaraq, Tövratda, Allahın şanına yaraşmayan ifadələr vardır: “Və Rəbb insanı yaratdığına peşman oldu və qəlbindən peşmançılıq hissi keçirtdi.” (Təkvin, Bab: VI, ayə: 6) Bir ilahi kitabın, etdiyi və yaratdığı bir şeyə görə peşmançılıq hissi keçirməsini Allaha istinad etmək mümkün deyil.

3. Hz Musanın ölümü və dəfn mərasiminin Təsniyədə zikr edilməsi, Tövratın onun ölümündən sonra yazıldığını göstərir. (Təsniyə, bab: XXXIV, ayə: 5-8)

4. Bəzi peyğəmbərlərə çirkin böhtan atmaqları onların təhrif olduqlarının ən gözəl dəlilidir. Misal olaraq, Tövratın ifadəsinə görə Lut Peyğəmbərə qızları şərab içirtmiş, onu sərxoş edərək onunla zina etmiş və hamilə qalmışdırlar. Sonra da atalarından hərəsi bir oğlan uşağı dünyaya gətirmişdirlər (Təkvin, bab: XIX, ayə: 31-38); Hz Harunun buzova itaət etdiyi və bunu xalqına tövsiyə etdiyi (Xuruc, bab: XXXII, ayə, 1-6); Hz Nuhun üzüm bağı yetişdirərək şərab düzəltməsi və bundan içərək sərxoş

161. əl-Bəqərə 2, 75.
162. ən-Nisa 4, 46.
163. əl-Hicr 15, 9.

olmağı (Təkvin, bab: IX, ayə: 20-22) kimi rəvayətlər peyğəmbərlərin ismət sifəti və şəxsiyyətlərinə yaraşmayan istinad və böhtanlardır.

5. İlahi dinlərin hamısında dəyişməyən tövhid inancı olduğu halda, İncildə üçlü ilah inancının varlığı onun insanlar tərəfindən yazıldığını göstərir.

6. Əldə mövcud olan dörd İncildə belə, bab, ayə, mövzu və mövzunun ifadə tərzlərində çox böyük fərqliliklərin olması, onların insanlar tərfindən yazıldıqlarını göstərir. Əlavə olaraq İncillərdə ilahi kitablara yaraşmayacaq əxlaqsız təlqinlər mövcuddur.

## I. MƏLƏKLƏRƏ İMAN

Mələklərə iman, İslamın iman əsasları arasında əhəmiyyətli bir yer tutur. Qurani-Kərimdə mələklərə inanmağın fərz olduğu haqqında ayələr vardır. Belə ki, Qurani-Kərimdə Allah Təala belə buyurur: “**Peyğəmbər Rəbbi tərəfindən ona nazil edilənə inanmış və möminlər də iman gətirmişlər. Onların hamısı Allaha, Onun mələklərinə, kitablarına və bütün peyğəmbərlərinə iman gətirmişlər..**”[164] “**Yaxşı əməl sahibi əslində Allaha, axirət gününə, mələklərə, kitaba və peyğəmbərlərə inanan ...(kimsə)lərindir**”[165]

Mələklərə inanmayan kimsə, zikr etdiyimiz ayələri inkar etdiyi üçün kafir olar. Allah Təala bu ayələrdə də: “**Hər kim Allaha, Onun mələklərinə və peyğəmbərlərinə, Cəbrailə və Mikailə düşməndirsə, şübhəsiz ki, Allah da kafirlərə düşməndir.**”[166] “**Ey iman gətirənlər! Allaha və Peyğəmbərinə, Onun öz peyğəmbərinə endirdiyi kitaba (Qurana) və ondan əvvəl nazil etdiyi kitablara iman gətirin! Allaha, Onun mələklərinə, kitablarına, peyğəmbərlərinə və axirət gününə inanmayan kəs, şübhəsiz ki, çox azmışdır.**”[167]-deyə buyuraraq mələklərə düşmən olanları, onları inkar edənləri kafir olaraq adlandırmışdır. Ayrıca mələklərə inanmamaq, vəhyi, peyğəmbəri, peyğəmbərin gətirdiyi kitabı və təbliğ etdiyi dini də inkar etməkdir. Çünki dini hökmlər peyğəmbərə mələklər vasitəsilə gəlmişdir.

### A. Mələklərin Mahiyyəti

Mələklər hissiyyat orqanlarımızla idrak edilməyən, gözlə görülməyən, nurani və ruhani varlıqlardır. Bu baxımdan mələklər haqqındakı məlumatımızın yeganə mənbəyi vəhy, ayə və hədislərdir. Bunlardan əldə

164. əl-Bəqərə 2, 285.

165. əl-Bəqərə 2, 177.

166. əl-Bəqərə 2, 98.

167. ən-Nisa 4, 136.

etdiyimiz məlumatlara əsaslanıb, onlardan başqasını diqqətə almarıq. Mələklərin hissiyyat orqanlarımızla idrak edilməyən, gözlə görülməyən varlıqlar olması onları inkar etməmiz üçün səbəb deyildir. Nə ağıl, nə də pozitiv elmlər mələklərin var və ya yox olduğu haqqında dəqiq məlumat və dəlil verə bilməz. Çünki, mələklər dünyəvi varlıqlar deyildir. Mələklərin hansı maddədən yaradıldıqlarına dair Quranda bir məlumat yoxdur. Ancaq Peyğəmbərimiz, Hz Aişədən rəvayət edilən bir hədisdə: *“Mələklər nurdan, cinlər yalxı atəşdən, Adəm isə sizə bilinən şeydən (torpaq və palçıq) yaradıldı”*[168]-deyə buyuraraq, mələklərin nurdan yaradıldığını bəyan etmişdir.

**B. Mələklərin vəzifələri**

Mələklər, Allah tərəfindən verilən vəzifələri tam olaraq yerinə yetirən itaətkar varlıqlardır. İnsanlarla əlaqəli olaraq vəzifələndirilən mələklər isə onların ruhi və mənəvi həyatı ilə maraqlanmaqdadırlar. Mələklərin, bəziləri ortaq, bəzisi də müstəqil olmaqla bərabər Allah tərəfindən verilən vəzifələrini belə sıralamaq olar:

1. Allahı həmd və təsbeh etmək, Ona səcdə etmək, Allahı gecə-gündüz öymək və təqdis etmək və əmr olunan şeyləri yerinə yetirmək.

2. Peyğəmbərlərə vəhy gətirmək. Allah Təala, insanlar kimi mələklərdən də elçilər seçdiyini, Nuha və ondan sonrakı peyğəmbərlərə vəhy endirdiyi kimi, Hz. Məhəmmədə də vəhy göndərdiyini və Cəbrailin, Quranı Peyğəmbərin qəlbinə endirdiyini xəbər verməkdədir.

3. Peyğəmbərləri salat və salam ilə ucaltmaq, möminlərə axirətdə şəfaət etmək və bütün insanlara dünyada xeyir dua etmək. Qurani-Kərimdə şəfaət, qiyamət günü günahkarlar üçün Allaha yalvarıb dua etmək olub: “**Göylərdə neçə-neçə mələklər vardır ki, onların şəfaəti heç bir fayda verməz. Ancaq Allah öz istədiyi və razı olduğu kimsəyə izin verdikdən sonra**”[169]-deyə buyurulmuş, hədislərdə də şəfaətdən bəhs edilmişdir.

Belə ki, mələklər haqqında Qurani-Kərimdə Allah Təala bu mövzu ilə əlaqədar olaraq belə buyurur: “**Mələklər də Rəbbini həmd-səna ilə təqdis**

168. Müslim, Zühd, 10; Əhməd b. Hənbəl, Müsnəd, VI, 168.

169. ən-Nəcm 53, 26.

**edər və yerdəkilərin bağışlanmasını diləyərlər**"[170] "**Ərşi daşıyanlar və onun ətrafında olanlar (mələklər) öz Rəbbini həmd-səna ilə təqdis edir. Ona inanır və möminlərin bağışlanmasını diləyərək belə dua edir: "Ey Rəbbimiz! Sənin rəhmin və elmin hər şeyi ehtiva etmişdir. Artıq tövbə edib Sənin yoluna gedənləri bağışla, onları cəhənnəm əzabından qoru! Ey Rəbbimiz! Onları da, atalarından, zövcələrindən və nəsillərindən əməlisaleh olanları da özlərinə vəd buyurduğun Ədn cənnətlərinə daxil et. Şübhəsiz ki, Sən yenilməz qüvvət sahibi, hikmət sahibisən! Onları pisliklərdən qoru**"[171]-deyə dua edərlər. Mələklər şeytanların əksinə insanları yaxşılığa sövq edərlər. Hər insanın bir mələk və bir şeytan dostu olub, Quran birincisinə "Şahid", ikincisinə də "Saik" (sövq edən) deməkdədir.

4. Peyğəmbərlərə və möminlərə mənəvi güc verib, kafirləri sıxıntıya salmaq. Belə ki, Qurani-Kərimdə, mələklərin Allaha inanıb doğru yolda gedənlərə mənəvi güc verəcəkləri,[172] mələklər göndərərək düşmənə qarşı köməklik göstərəcəyi,[173] kafirlərin boyunlarına və barmaqlarına vurmalarını əmr etdiyi[174] xəbər verilməkdədir.

5. İnsanı qoruyaraq ona xidmət edərlər. Quranda, önündə və arxasında insanı qoruyan təqibçilərin olduğu bildirilməkdədir.[175]

6. İnsanların hərəkətlərini və feillərini qeyd edərlər. Belə ki, Qurani-Kərimdə Allah Təala bu barədə belə buyurur: "**Sizdən sözünü gizlədən də, onu açıq deyən də, gecənin qoynunda gizlənən də, gündüz aşkar gəzib dolanan da eynidir. İnsan üçün onu öndən və arxadan təqib edənlər (mələklər) vardır.**"[176]

7. Kainatın idarə edilməsi və ilahi qanunların icrasıyla məşğul olurlar. Belə ki, Qurani-Kərimdə insanların canını alan ölüm mələyindən söz edilməsi,[177] ana rəhmində təşəkkül edən hər canlı üçün bir doğum

170. əş-Şura 42, 5.
171. əl-Mumin 40, 7-9.
172. Füssilət 41, 130-132.
173. Ali-İmran 3, 124-125.
174. əl-Ənfal 8, 12.
175. ər-Rəd 13, 11.
176. ər-Rad 13, 11.
177. əs-Səcdə 32, 11.

mələyinin mövcud olması,[178] ilahi iradənin yerinə yetirilməsi üçün vasitəçi olduqları bəyan edilir.

8. Mələklər, ilahi cəzaları icra edən varlıqlardır. Möminlərə köməklik etdikləri kimi, kafirlər haqqında verilən cəzaları da icra edirlər. Quran, elçi olaraq mələklərin göndərilməsini istəyən kafirlərə: "**Göyün buludla parçalanacağı, mələklərin bölük-bölük endiriləcəyi gün- O gün həqiqi hökm ancaq Rəhmana məxsusdur; o, kafirlər üçün isə çətin bir gün olacaqdır**"[179]-deyə buyuraraq günahkar qulların başına gələcək əzabı xatırladır.

### C. Mələklərin sayı və növləri

Mələklərin sayını ancaq Allah Təala bilir. Qurani-Kərimdə cəhənnəmin işləri ilə məşğul olan mələklər olduğu bildirildikdən sonra, "**Rəbbinin ordusunu Özündən başqa heç kim bilməz**"[180]-deyə buyurur. Bu ifadədən mələklərin sayısının çox olduğu və bu sayın ancaq Allah Təala tərəfindən bilindiyi məlum olur.

Mələklərin növləri və vəzifələri haqqında nasslardan bəzi mələklərin adları və vəzifələri (Cəbrail, Mikail kimi), bir qisminin də sadəcə vəzifələrinin zikr edildiyi məlumdur (Ölüm mələyi, arşı daşıyanlar kimi).

Bu mələklərin vəzifə və xüsusiyyətlərini sıralayaraq onlardan bəhs edək:

1. **Cəbrail**: Vəhy mələyinin xüsusi adıdır. Qurani-Kərimdə üç yerdə Cibril olaraq keçir. Ayrıca Cəbraili ifadə etmək üçün ər-Ruh, ruhana, rəsulu-kərim, rəsulu-rabbik, ər-ruhul-əmin və ruhulqüdüs isimləri də zikr edilməkdədir. Hədisdə isə "ən-namus" olaraq keçməkdədir.

2. **Mikail**: Qurani-Kərimdə sadəcə bir yerdə keçir və belə buyurulur: "**Hər kim Allaha, Onun peyğəmbərlərinə və mələklərinə, Cəbrailə və Mikailə düşməndirsə, şübhəsiz ki, Allah da kafirlərə düşməndir**"[181]

178. Buxari, "Bədül-xalq", 6.

179. əl-Furqan 25, 25-26.

180. əl-Müddəssir 74, 31.

181. əl-Bəqərə 2, 98.

3. **Əzrail**: Ölüm mələyinin xüsusi adıdıır. Əzrail ismi də Qurani-Kərimdə keçmir. Bunun yerinə ölüm mələyi (məlakül-mövt), əcəli çatanların ruhunu alan mələkdən bəhs edilir.

4. **İsrafil**: Bu mələyin də adı Qurani-Kərimdə keçmir. Bir çox yerdə sura üfləyəcəyi ifadəsi ilə ondan bəhs edilməkdədir. Hədislərdə isə onun adı dörd böyük mələk arasında zikr edilməkdədir.

5. **Müqərrəbun Mələkləri**: Bunlara İlliyyun və Kəribiyyun mələkləri də deyilir. Nisa surəsinin 172-ci ayəsində Məsih və Allaha yaxın mələklərin Allahın qulu olmaqdan çəkinmədikləri bildirilir. Qurani-Kərimdə ərşi daşıyanlar və onun ətrafında olanlar-deyə ifadə edilən, Allahı həmd-səna edən mələklər də bu qrupa daxildir.

6. **Hafaza və Kiramən Katibin Mələkləri**: İnsanların yaxşı və pis əməllərini yazan, onları qoruyan mələklərdir.

7. **Cənnət və Cəhənnəmlə Vəzifəli Olan Mələklər**: Bunlar cənnət və cəhənnəmdəki işlərlə vəzifələndirilən mələklərdir. Cənnətdəki mələklər möminlərə xidmət edərək onlarla dostluq edərlər. Bir ayədə o mələklərin cənnətliklərə belə deyəcəkləri bildirilir: "**Mələklər də hər bir qapıdan daxil olub-"(Dünyada Allah yolunda hər bir çətinliyə) səbr etdiyinizə görə sizə salam olsun! Axirət yurdu nə gözəldir!"-deyəcəklər.**"[182] Cənnət mələklərinin başçısına Ridvan adı verilir.

Cəhənnəm mələkləri və ya zəbanilər isə kafirlər cəhənnəmə gəldiyi zaman onları qarşılayacaq və onlara əzab edəcəklər. Bunların başçısına Malik adı verilir. Belə ki, Qurani-Kərimdə Allah Təala bu barədə belə buyurur: "**Ey iman gətirənlər! Özünüzü və əhli-əyalınızı elə bir oddan qoruyun ki, onun yanacağı insanlar və daşlar, xidmətçiləri isə Allahın onlara verdiyi əmrlərə asi olmayan, buyurduqlarını yerinə yetirən daş qəlbli və çox sərt təbiətli mələklərdir.**"[183]

8. **Harut və Marut**: İnsanlara sehr elmini öyrətmək və onları imtahan etmək üçün göndərilən iki mələk olduqları bildirilir. Qurani-Kərim bu məsələ ilə əlaqədar olaraq başqa məlumat vermir. Mötəbər hədis kitablarında Buxari, Kitabut-tibbin sehrə aid etdiyi 47 babın başlığında Bəqərə surəsinin 102-ci ayəsini zikr etmiş, buna görə də bu ad burda təsvir edilmişdir.

182. ər-Rad 13, 23-24.

183. ət-Təhrim 66, 6.

Bunların xaricində başqa bir məlumat yoxdur. Əhməd b. Hənbəl isə, bu mələkləri insanlar kimi bəzi arzu və istəkləri olan varlıqlar olaraq təsvir etmişdir.

8. **Münkər və Nəkir**: Qəbirdə sual-cavab işi ilə vəzifəli olan mələklərdir. Qurani-Kərimdə bunların adı zikr edilmişdir. Hədislərdə isə ölü dəfn edildikdən sonra ona, biri Münkər, o biri isə Nəkir deyilən qara saçlı, mavi gözlü iki mələyin gəldiyi, qəbirdə oturub suallar soruşduğu, verdiyi cavablara görə qəbrini genişlədən və ya daraldan mələklər olaraq rəvayət edilir.

## II. ŞEYTAN VƏ CİN

### A. Şeytan

Ərəb filoloqları **şeytan** kəlməsinin "yanmaq, həlak olmaq" mənasına gələn **şeyt** kökündən və ya "uzaq olmaq, müxalifət etmək" mənasına gələn **şatn** kəlməsindən gəldiyi qənaətindədirlər. Termin olaraq "insanları azdırmağa çalışan, kibirli və gözlə görülməyən ruhani bir varlıq" deməkdir. Qurani-Kərimdə İblis kəlməsi bir yerdə şeytan,[184] onun xaricindəki ayələrdə isə şeytanların atası olaraq keçməkdədir. Misal olaraq, mələklərin Adəmə səcdə etmələri[185] və insanlardan şeytanın ordusuna tabe olmamaları[186]istənməklə şeytan kəlməsinin zikr edildiyini ifadə etmək olar.

Qurani-Kərimdə İblisin mahiyyəti haqqında əlavə məlumat verilmir. Sadəcə Adəmə niyə səcdə etməməsinin səbəbi şoruşulduğu zaman: "**Mən ondan daha yaxşıyam, çünki Sən məni oddan, onu isə palçıqdan yaratdın!**"[187]-deyərək öz ağzından atəşdən yaradıldığı ifadə edilir. Ancaq onun mələk, cin və ya başqa bir varlıq olduğu haqqında açıq bir məlumat yoxdur. Hər nə qədər Quranda "Cinlərdən idi"[188] ifadəsi keçsə də, burdakı "cin" kəlməsi üzərində ixtilaflar vardır.

184. Səbə 34, 20.
185. əş-Şuəra 26, 95.
186. əl-Bəqərə 2, 34.
187. əl-Əraf 7, 12;  Sad 38, 76.
188. əl-Kəhf 18, 50.

Allah Təala insana həm onu ən yüksək mərtəbələrə ucaldan ülvi duyğular, həm də onu ən aşağı səviyyəyə düşürəcək süfli duyğular vermiş və bunun müqabilində insanla maraqlanmaq və məşğul olmaq üçün mələkləri və şeytanları yaratmışdır.

Şeytan kəlməsindən Qurani-Kərimdə, ifadə etdiyimiz cin şeytanları kimi çox azğın, aldadan, vəsvəsə verən və küfrü təlqin edən insanlar mənasında insan şeytanları olaraq da istifadə edilmişdir.[189] Bəzi hədislərdə isə, şeytanın açıq olan qapılara və əsnəyən insanın ağzına girəcəcəyi, damarlarda gəzdiyi ifadə edilmişdir. Bəzi alimlər isə şeytanı hər insanın fitrətində olan nəfsi-əmmarə deyə izah etmişdirlər.

Quran və hədislərdə yer alan ifadələrdən məlum olur ki, şeytan insanlara xaricdən təsir edən və insanları haqq yolundan döndərən bir varlıqdır. Ancaq bilirik ki, nəfs insanın daxilindədir və onun xaricdən təlqini mümkin deyildir.

Şeytan Allahın hüzurundan qovulduqdan sonra Allahdan cəzasının qiyamət gününə qədər təxirə salınmağını istəmiş, bu istəyin qəbul edilməməsini nəzərə alaraq[190] Hz Adəmdən etibarən insanları haqq yoldan uzaqlaşdırmaq üçün əlindən gələni edəcəyini bildirmişdir.[191]

Onun, insanları onların görməyəcəyi yerdən gördüyü, onlara sağ, sol, ön və arxadan yanaşdığı, boş şeylərə meyl etdirərək insanları yalançı vədlərlə aldatdığı, Allahın əmrlərinə itaətsizlik etdirib harama təşviq etdirdiyi, insanları bir-birinə düşmən etdiyi, vəsvəsə, hiylə və tələ qurduğu xəbər verilməkdədir. Bəzi elmihal və vəz kitablarında şeytanın qarşısı alınmayan bir gücə sahib olduğu bildirilir ki, bu da insanı ümidsizliyə saldığı üçün səhv bir məlumatdır. Halbuki, Quranda onun tələlərinin zəif olduğu[192] bildirilməkdədir.

### B. Cin

“Örtmək, gizləmək” mənasına gələn Cin hissiyyat aləminin xaricində olan varlıqlara verilən isimdir. Qurani-Kərimdə cinlərin mütləq itaətkar

189. əl-Bəqərə 2, 14; Ali-İmran 3, 175; ən-Nas 114, 6.
190. əl-Əraf 7, 13-16.
191. ən-Nəhl 16, 63.
192. ən-Nisa 4, 76.

olan mələklər və daim üsyankar olan şeytanlardan fərqli olaraq bəhs edilməkdədir. Quran daha əvvəlki millətlərdə mövcud olan cin inancını düzəltmiş və bəzi sərhədlər qoymuşdur. İslamdan əvvəlki ərəblər, cinləri mələk və şeytanları da əhatə edən və tanrıya aid olan xüsusiyyətlərə malik olan varlıqlar kimi qəbul etmiş, onların şərlərindən qorunmaq üçün qurbanlar kəsib ibadət etmişdirlər. Quran, cinlərə aid olan bu xüsusiyyətləri rədd etmiş, onların da insanlar kimi şüur və iradəyə sahib olduğunu,[193] Allaha qarşı məsuliyyət daşıdıqlarını,[194] insanlar kimi Allaha ibadət etmək üçün yaradıldıqlarını,[195] özlərinə elçilər göndərildiyini, onlardan da inanan və inanmayanların mövcud olduğunu[196] xəbər vermişdir. Hz Aişədən rəvayət edilən bir hədisdə insanın palçıqdan, mələklərin nurdan, cinlərin də oddan yaradıldığı bildirilmişdir.[197]

Cinlərin insanlarla olan əlaqələri xalq arasında "cin vurması" deyə də ifadə edilir. Belə ki, cinlərin insan bədəninə girərək onu ruhən və ya bədənən xəstə etdikləri bilinməkdədir. Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq bir yerdə "**şeytan vurmuş**"[198], on bir yerdə "**cinlərə uğrama (məcnun)**" və bir çox yerdə "**vəsvəsə və təlqin ilə insana təsir etdikləri**" kimi ifadələr keçməkdədir.

Müşriklərin anlayışına görə yüksək məqamlardan insanlara çatdırılan bilgilərin (ilham) mənbəyi cinlərdir. Odur ki, onlar Hz Məhəmmədə nazil olan Quranın ona cinlərin ilham etdiyini düşünərək Peyğəmbərə "məcnun" deməyə başladılar.[199] Guya cinlər insanlarla maddi və bədəni əlaqələr deyil, ilham və xəbər vermə, təlqin etmə və vəsvəsə vermək kimi təsirlər etməkdədirlər.

---

193. ər-Rəhman 55, 39; əl-Cin 72, 2, 10-11.
194. Fussilət 41, 25
195. əz-Zariyat 51, 56.
196. əl-Cinn 72, 2, 4,
197. Müslim, "Zühd", 60.
198. əl-Bəqərə 2, 275.
199. əl-Hicr 15, 6; əs-Saffat 37, 36; əd-Duxan 44, 14.

# VI FƏSİL
# AXİRƏT GÜNÜ VƏ AXİRƏTƏ İMAN

## I. AXİRƏT GÜNÜ VƏ AXİRƏTƏ İMAN

Axirət kəlməsi ərəb dilində, axırıncı və sonra olan, axırıncı gün mənasına gələn bir kəlmə olub, bu dünyanın axırına, bu dünyadan başqa ölümlə başlayan və sonsuz həyata deyilir. Termin olaraq, qiyamətin qopması üçün İsrafilin (ə.s) sura ilk dəfə üfürməsindən ikinci dəfə üfürməsinə və ondan sonra cənnətlik olanların cənnətə, cəhənnəmlik olanların da cəhənnəmə girməsinə qədər keçəcək zamana, yaxud sura ikinci dəfə üfürdükdən sonra başlayıb, sonsuza qədər olan zaman müddətinə verilən vaxta deyilir. Bu tərifə görə axirət günü, sura üfürülmə, insanların yenidən dirildilmələri, hər kəsə əməl dəftərlərinin verilməsi, əməllərin tərəzidə ölçülməsi, bu dünyadakı əməllərə görə hər kəsin hesab verməsi, şəfaət, sirat, cənnət və cəhənnəm..kimi xüsusları əhatə etməkdədir.

Axirət gününə iman, İslamın iman əsaslarından olub ümumiyyətlə Qurani-Kərimdə Allaha imanla yan-yana zikr edilmişdir. Belə ki, bu mövzu ilə əlaqədar olan ayələrdən bəzisini zikr edək:

“**Yaxşı əməl sahibi əslində Allaha, axirət gününə, mələklərə, kitaba və peyğəmbərlərə inanan....insanlardır.**”[200]

“**O kəslər ki, sənə göndəriləvə və səndən əvvəl göndərilənlərə iman gətirir və axirətə də şəksiz inanırlar.**”[201]

Axirət və axirətdəki aqibətlər, qeyb aləminə aid məlumatlar olduğu üçün ağıl və pozitiv elmlər bunu izah edə bilməz. Bu mövzuda əldə edəcəyimiz məlumatların yeganə mənbəyi vəhydir. Ancaq bunu da unutmamaq lazımdır ki, axirətdəki aqibət ilə dünya həyatı əsla bir-birinə bənzəmir. Misal olaraq, insanların əməlləri tərəzidə çəkiləcək, hər kəsin dəftəri meydana çıxacaq dediyimiz zaman ağlımıza dünyadakı bir tərəzi və ya

200. əl-Bəqərə 2, 177.

201. əl-Bəqərə 2, 4.

satılan dəftər gəlməməlidir. Onların həqiqi formasını və mahiyyətini ancaq Allah Təala bilir. Biz onların var olduğuna inanırıq, mahiyyəti haqqında isə müzakirə aparmırıq.

İslam dini axirət inancına böyük əhəmiyyət vermişdir. Belə ki, axirət inancından bəhs etməyən aşağı-yuxarı heç bir surə yoxdur. Qurani-Kərim axirət fikrini bəzən açıq dəlillər, bəzən də misallar verərək zehinlərimizə həkk etmişdir.

Axirətə inanmaq, ilahi ədalətin bir nəticəsidir. Bu dünyada hər kəs işlədiyi günahın cəzasını çəksə də bəzi haqsızlıqlar meydana gəlməkdədir. Ancaq, axirətdə bu belə olmayacaqdır. Açıq və gizli olan hər şey orada bilinəcək, Allah pis insanları əzab ilə cəzalandıracaq, yaxşılara da mükafat olaraq cənnəti verəcəkdir. Beləcə ilahi ədalət gerçəkləşəcəkdir. Quranda bu mövzu ilə əlaqədar olaraq belə buyurulur:

**“Həqiqətən, Allahdan qorxub pis əməllərdən çəkinənləri Rəbbi yanında Nəim cənnətləri gözləyir! Məgər Biz müsəmanları kafirlərlə eynimi tutacağıq?! Sizə nə olub, necə mühakimə yürüdürsünüz? Yoxsa bir kitabınız vardır ki, bunları orada oxuyursunuz?! Yaxud orada bəyənib seçdiyiniz hər şeyin sizin olacağı yazılmışdır?! Və ya: “Nə hökm etsəniz sizin olacaqdır”-deyə Bizdən qiyamət gününədək davam edəcək əhd almısınız?!”**[202]

**“Yoxsa dünyada pis əməllər edənlər axirətdə onları iman gətirib yaxşı işlər görənlərlə bir tutacağımızı, onların həyatlarının və ölümlərinin eyni olacağını güman edirlər?! Onlar nə pis mühakimə yürüdürlər! Allah göyləri və yeri haqq-ədalətlə və hər kəsin qazandəğı nə isə onun müqabilində əvəz görməsi üçün yaratmışdır. Və onlara heç bir haqsızlıq edilməyəcəkdir.”**[203]

Hər iki ayədən də aydın olur ki, yaxşılarla pisləri bir tutmaq ilahi ədalətə ziddir. Allahın adaləti və hikməti bu iki qrupu fərqləndirə bilir. Bu dünya bir imtahan yeridir, axirətin tarlasıdır. Bu dünyada nə əkilsə axirətdə də o biçiləcəkdir. **“Yoxsa sizi əbəs yerə yaratdığımızı və hüzurumuza**

202. əl-Qələm 68, 34-39.

203. əl-Casiyə 45, 21-22.

**qaytarılmayacağınızı güman edirdiniz? Həqiqi hakim olan Allah ucadır. Ondan başqa heç bir tanrı yoxdur. O, kərim olan ərşin Rəbbidir.”**[204]

“**Məgər insan elə güman edir ki, o, başlı-başına buraxılacaq?! Məgər o tökülən bir qətrə məni deyilmi?! Sonra laxtalanmış qan oldu və onu yaradıb surət verdi. Sonra da ondan biri kişi, biri qadın olmaqla iki çift yaratdı. Elə isə O Allah ölüləri diriltməyə qadir deyildirmi?**”[205]

Tarixdən günümüzə qədər keçən zamana nəzər salsaq görərik ki, insanda bir əbədilik duyğusu vardır. Bundan başqa “İnsan sadəcə bu həyat və bu qısa müddət üçün yaradılmamışdır” şəklindəki insan fitrətində var olan düşüncəsi də bizi əbədi bir aləm fikrinə aparmaqdadır.

## II. AXİRƏT HƏYATI

### A. Qəbir Həyatı

İki cür qiyamət vardır. Bunlardan biri İsrafilin (ə.s) sura üfürməsi ilə qopacaq olan qiyamətdir ki, buna böyük qiyamət deyirik. Digəri isə kiçik qiyamət olan ölümdür. Ölüm ilə başlayıb, axirət həyatının ikinci dövrəsi olan “ölümdən sonra təkrar dirildilmə” anına qədər davam edən dövrəyə qəbir həyatı və ya bərzah deyilir. Hər insan, istər ölərək torpağa basdırılsın, istər boğularaq dənizin dibində qalsın və ya yırtıcı bir heyvan tərəfindən parçalansın ya da yanaraq külü havaya qarışsın, mütləq qəbir həyatını yaşayacaq və qiyamət günü dirildiləcəkdir. İnsan qəbrə qoyulduqdan sonra, Münkər və Nəkir adında iki mələk gəlir və “Rəbbin kimdir? Peyğəmbərin kimdir?...” –deyə suallar soruşur. İman və saleh əməl sahibi olan insanlar bu suallara doğru cavab verirlər. Belə insanlara cənnət qapıları açılaraq cənnət göstərilir. Kafir və ya münafiq olanlar isə bu suallara doğru cavab verə bilməzlər. Onlara da cəhənnəm qapıları açılır və cəhənnəm göstərilir. Kafirlər və münafiqlər qəbrdə əzab görəcək, möminlər isə nemətlərlə sıxıntısız yaşayacaqdırlar. Qəbirdə nemət və əzabın varlığını göstərən ayə və hədislər vardır. Belə ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur: **“Beləliklə, Allah onu onların qurduğu hiylələrin**

204. əl-Muminun 23, 115-116.
205. əl-Qiyamə 75, 36-40.

**şərindən qorudu. Firon əhlini isə şiddətli əzab verdi. Onlar səhər-azşam odda yandırılırlar. Qiyamət qopduğu gün isə: "Firon əhlini ən şiddətli əzaba salın!"**[206]

Peyğəmbər əfəndimiz bir məzarlıqdan keçərkən iki məzardakı ölünün yüngül şeydən ötrü əzab çəkdiyini gördü. Bu iki məzardakı ölülərdən biri həyatında ara vuranlıq edir, digəri isə təharətə (tualet ədəbinə) diqqət etmirdi. Bunun üzərinə Rəsulullah yaş bir budaq alaraq ortadan iki yerə bölmüş və hər parçasını bir qəbrin üstünə qoymuşdur. Bunu görən əshab Peyğəmbərdən bu hərəkətinin səbəbini soruşduqda, Peyğəmbər: "*Bu iki budaq qurumadığı müddət ərzində onların çəkdiyi əzabın yüngülləşməsi ümid edilir."*[207]-buyurdu.

Peyğəmbər əfəndimiz bir başqa hədisində də: "Qəbir, ya cənnət bağçalarından bir bağça və ya cəhənnəm çuxurlarında bir çuxurdur"[208]-deyə buyurmuşdur.

### B. Qiyamət və qiyamət əlamətləri

Qiyamət kəlməsi lüğətdə qalxmaq, dikəlmək, doğrulamaq və dirilmək mənasına gəlir. Termin olaraq qiyamətin iki mənası vardır. Birincisi kainatdakı nizamın pozulması və hər şeyin yox edilməsidir. İkincisi isə yox olan və ölən şeylərin yenidən dirildilərək ayağa qalxması və məhşərə doğru yönəlməsidir. Qiyamətin mütləq qopacağı haqqında Qurani-Kərimdə belə buyrulur:

"**Ey insanlar! Rəbbinizdən qorxun. Həqiqətən, qiyamət gününün zəlzələsi dəhşətli şeydir! Onu görəcəyiniz gün hər bir əmzikli qadın əmizdirdiyi uşağını unudar, hər bir hamilə qadın bari-həmrini yerə qoyar (uşaq salar). İnsanları sərxoş görərsən, halbuki, onlar sərxoş deyillər. Ancaq Allahın əzabı çox şiddətlidir!**"[209]

---

206. əl-Mumin 40, 45-46.
207. Buxari, Cənaiz, 82: Əbu Davud, Təharət 26.
208. Tirmizi, Qiyamət, 26.
209. əl-Həcc 22, 1-2.

“**O gün göy görərmiş mis kimi olacaq. Dağlar da didilmiş yun kimi olacaqdır. Və dost dostu arayıb axtarmayacaqdır.**”[210]

“**Və: “Qiyamət günü nə vaxt olacaqdır?**”**-deyə soruşar. Göz bərələcəyi; Ay tutulacağı; Günəşlə ay birləşəcəyi zaman. Məhz o gün insan: “Qaçıb can qurtarmağa yer haradadır?”-deyəcəkdir. Xeyir, hec bir sığınacaq olmayacaqdır! O gün duracaq yer ancaq Rəbbinin hüzurudur!”**[211]

Qiyamətin nə zaman qopacağını ancaq Allah bilir. Bu mövzuda nə Hz Peyğəmbər, nə ona vəhy gətirən Cəbrail, nə də sura üfürməklə vəzifəli olan İsrafil xəbərdardır. Allah Təala qiyamətin qopacağının ancaq özünün bildiyini müxtəlif ayələrdə bildirmişdir:

**“Həqiqətən, o saatı (Qiyamətin qopacağı vaxtı) ancaq Allah bilir”**[212]

**“O saatı (Qiyamətin qopacağı vaxtı) bilmək yalnız Ona aiddir”**[213]

Müsəlman üçün əsas olan, qiyamətin nə zaman qopacağı deyil, onun qopmasından sonrakı əbədi olan həyata hazırlıqlı olmaqdır. Qiyamətin nə zaman qopacağını bilmək mümkin olmasa da, Hz Peyğəmbər bəzi hədisləri ilə onun yaxınlaşdığını göstərən əlamətlərdən bizi xəbərdar etmişdir. Bir ayədə qiyamət əlamətləriylə əlaqədar olaraq belə buyurulur: **“Onlar (kafirlər) ancaq o saatın qəfildən başlarının üstünü almasınımı gözləyirlər? Onun əlamətləri artıq gəlmişdir. Onlara gəlib yetişdiyi zaman ibrət almaları onlara nə fayda verər?!**”[214]

Qiyamət əlamətlərinə yer verilən bəzi rəvayətlərdə Yəmən və ya Hicaz tərəfində çox qüvvətli bir odun peyda olacağı və peyda olacağı yeri aydınladacağı, insanları həşr olunacaqları yerə aparması, biri şərqdə, biri qərbdə, biri də Ərəb yarımadasında olmaq üzrə üç yerin batacağı xəbər verilmişdir. Quran qiyamət haqqında sıx-sıx bəhs etməkdədir. Qurani-Kərimdə Qiyamətin mütləq qopacağı, vaxtının yaxınlaşdığı, vaxtını ancaq Allahın bildiyi xəbər verildikdən sonra qiyamətin necə qopacağı ətraflı bir

210. əl-Məaric 70, 8-10.
211. əl-Qiyamə 75, 6-12.
212. Loğman 31, 34.
213. Fussilət 41, 47.
214. Muhəmməd 47, 18.

şəkildə izah edilmişdir. Belə ki, surun üfürülməsi, Allahın dilədiyi xaric göydə və yerdə olan bütün canlı məxluqların ölməsi, ərz və dağların bir-birinə dəyərək darmadağın olması bildirilmişdir. Qiyamət qopmağa başladığı zaman dağların yıxılıb parçalanacağı, dənizlərin bir-birinə qarışacağı, göyün parçalanacağı, günəşin bürüləcəyi, ayın tutulacağı, ulduzların töküləcəyi, ışıqların söndürüləcəyi, qulaqların kar ediləcəyi, hamilə qadınların uşaqlarını düşürəcəyi, uşaq əmizdirən qadınların uşaqlarını atıb qaçacağı və s. xəbər verilmişdir.

Alimlər qiyamət əlamətlərini kiçik və böyük olmaqla iki yerə ayırmışdırlar.

**a) Kiçik əlamətlər**

Böyük əlamətlərə görə, qiyamətin qopma zamanından daha uzaq olan, insanların hür iradələri ilə həyata keçirdikləri hadisələrdir. Peyğəmbər əfəndimizin hədislərinə istinad edərək qiyamətin kiçik əlamətlərini belə sıralamaq olar:

1. Peyğəmbərimizin göndərilməsi və peyğəmbərliyin onunla sona çatması.

2. Elmin azalıb, cahilliyin artması, şərab içməyin və zinanın açıq şəkildə edilməsi.

3. Qadın nüfusunun kişilərə görə çoxalması.

4. Yüksək binaların inşa edilməsi, layiq olmadığı halda insanların vəzifələndirilməsi.

5. Adam öldürmə hadisəsinin çoxalması.

6. Davaları bir olan iki islam ordusunun bir-biriylə vuruşması.

7. Allahın elçisi olduğunu iddia edən otuza yaxın Dəccalın meydana çıxması.

8. Dünya malının bol olması, zəkat verəcək fəqirin olmaması.

**b) Böyük əlamətlər**

Peyğəmbər əfəndimizin bir hədisində “Qiyamətdən on əlaməti görmədiyiniz müddətcə dünyanın sonu gəlməz” deyə buyurmuş və bu əlamətləri belə sıralamışdır: Duman, Dəccal, Dabbətül-ərz, Günəşin qərb-

dən doğması, Yəcuc və Məcuc, Məryəm oğlu İsanın enişi, Şərqdə, qərbdə və ərəb yarımadasında yer batması, İnsanları önünə alaraq məhşər yerinə aparacaq olan bir atəşin Yəməndən çıxması.

**1. Duman (Duhan)**: Mömінləri qrip xəstəliyinə bənzər bir hala gətirən və kafirləri sərxoş edən bir dumanın çıxması və bütün yer üzünü bürüməsi.

**2. Dəccal**: Bu isimdə bir şəxs peyda olacaq və tanrılıq iddiasında olacaq, istidrac adı verilən bəzi qeyri adi hərəkətlər göstərəcəkdir. Hz Peyğəmbərimiz bir hədisində belə buyurmuşdur: *“Allah elə bir peyğəmbər göndərməmişdir ki, o peyğəmbər ümmətini Dəccal ilə qorxutmasın Dəccalın aranızdan çıxacağına şübhə yoxdur. Onun haqqında hec bir şey gizli qalmayacaqdır. Dəccalın sağ gözünün kor olduğu, sanki yerindən çıxmış kimi olduğunu açıq şəkildə görəcəksiniz, ancaq, Rəbbinizin gözünün kor olmadığını bilirsiniz.”*[215]

Bir çox alimə görə qiyamətə yaxın Dəccal çıxacaq və Hz. İsa tərəfindən öldürüləcək. Alimlərin bir qismi də, onun şər və təxribat üçün istifadə edilən bir simvol olduğunu və hər dövrdə bir Dəccalın olacağı düşüncəsindədirlər. Belə ki, hər dövrdə yalançı və aldadanların var olacağı mümkin olduğu üçün, ümmətin bu mövzuda diqqətli olmaları gərəkməkdədir.

**3. Dabbətül-ərz**: Dabbə kəliməsi Qurani-Kərimdə tək və cəm olaraq on səkkiz dəfə keçməkdədir. Bunlardan sadəcə biri qiyamət əlamətlərinə mövzu olacaq şəkildə zikr edilmişdir. Belə ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur: “**Onlara deyilən söz yerinə yetdiyi zaman onlar üçün yerdən bir heyvan çıxardarıq ki, onlarla danışıb: “İnsanlar ayələrimizə inanmırdılar!”-deyər. O gün hər ümmətdən ayələrimizi təkzib edənləri dəstə-dəstə yığarıq. Sonra onlar sürüklənərlər.”**[216]

Hədislərin əksinə, Qurani-Kərimdə dabbə “kafirlərə vəd edilən əzab gəldiyi zaman yerdən çıxan və onlarla danışan” xaricində başqa cür təsvir edilməmişdir. Quranın ifadələrindən əzabın olacağı zaman ilə həşr günü arasında bir əlaqənin olduğu məlum olur. Ya da Yəcuc və Məcuc kimi qiyamətin qopmasından öncə ortaya çıxan bir əlamət deyil, qiyamətin qopması ilə ortaya çıxan bir hadisə olduğunu göstərir.

215. Buxari, Fitən, 26; Əbu Davud, Məlahim, 14.

216. ən-Nəml 27, 82-83.

**4. Hz. İsanın Nüzulu**: Qurani-Kərimə görə Hz. İsa atasız olaraq dünyaya gələn, bəzi möcüzələr verilərək İsrailoğullarına peyğəmbər olaraq göndərilən bir insandır. İsrailoğulları əvvəlcə Onu yalançı olmaqda ittiham etmiş, sonra isə çarmıxa keçirtmək istəmişlər. Ancaq Allah Təala ono xilas edərək öz dərgahına qaldırmışdır. Hz İsanın ruh, bədən yaxud bədən və ruh olaraq Allahın dərgahına yüksəldiyi ixtilaflıdır. Bəzi təfsir alimləri onun təkrar dünyaya gələcəyini ifadə etmək üçün rəf kəliməsinə ruh-bədən olaraq məna vermişdirlər. Ali-İmran surəsinin 55-ci ayəsində göstərilən "**Ya İsa. Həqiqətən, Mən sənin ömrünü tamam edib Öz dərgahıma qaldıraram**" cümləsini də bunun dəlili olaraq göstərirlər. Sonra da Hz İsa bədən ilə göyə çıxarıldı, hələ də orada yaşayır və bir gün dünyaya gəlib son vəzifəsini icra etdikdən sonra öləcəkdir, -deyirlər. Nüzulu haqqında isə "**Kitab əhlindən elə bir kəs olmaz ki, ölümündən əvvəl ona (İsaya) iman gətirməsin**"[217] ayəsindəki "ölümündən əvvəl" ifadəsi ilə "Şübhəsiz ki, **o, (İsanın zühuru) qiyamətin bir əlamətidir**"[218] ayəsindəki "o" zamiri Hz İsanın dönəcəyini və qiyamətin xəbərçisi olduğunu bildirməkdədir.

Digər müfəssirlər isə Qurani-Kərimdəki ifadələrin "Hz. İsanın yəhudilərdən qorunduğunu, daha sonra əcəli gəldiyi zaman öldüyünü və ruhunun yüksəldiyini" mənasına gəldiyini bəyan etmişdirlər. Bu müfəssirlərə görə "ölümündən əvvəl" deyə bəhs edilən kitab əhli, "o" zamiri də Quranı ifadə etməkdədir.

**5. Günəşin qərbdən çıxması**: Peyğəmbərimiz bu mövzu haqqında belə buyurmuşdur: *"İlk çıxacaq qiyamət əlaməti, günəşin batdığı yerdən çıxması və quşluq vaxtı insanların üzərinə Dabbənin çıxmasıdır. Bu ikisindən hansı dostundan tez çıxsa, o biri də onun arxasınca peyda olar"*[219] "*Günəş şərq tərəfdən çıxmadığı müddətcə qiyamət qopmaz. Günəş qərbdən çıxan zaman insanlar bu hadisəni görəcək və iman edəcəklər. Ancaq bu, əvvəlcədən iman etməyən və ya imanında xeyir və fəzilət əldə etməyən insanların imanlarından fayda görməyəcəkləri zamandır."*[220]

**6. Yəcuc və Məcuc**: Bu isimdə iki qəbilənin yer üzünə səpələnərək bir müddət orada təxribat etmələri, qiyamətin bir başqa əlamətidir. Belə

217. ən-Nisa 4, 159.

218. əz-Zuxruf 43, 61.

219. Müslim, Fitən, 118; Əbu Davud, Məlahim, 12.

220. Buxari, Fitən, 25; Əbu Davud, Məlahim, 12.

ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur: **“Onlar dedilər: Ey Zülqarneyn! Yəcuc-Məcuc bu ərazidə fitnə-fəsad törədirlər. Bizimlə onlar arasında bir sədd çəkmək üçün sənə müəyyən məbləğ versək olarmı?”**[221] “**Nəhayət, Yəcuc-Məcuc (səddinin) açılıb onlar hər tərəfdən sürətlə axışdıqları zaman. Doğru vəd yaxınlaşdıqda kafir olanların gözləri dərhal bərəlib: “Vay halımıza! Biz bundan qafil idik. Xeyr, biz zalım olmuşuq deyərlər.**”[222]

Yəcuc və Məcucun, qiyamətdən öncə və ya qiyamət qoparkən ortaya çıxacağı haqqında ixtilaf olub dəqiq bir məlumat yoxdur. Bundan əlavə bu ismin xüsusi bir isim, ya da sifət olduğu da Qurani-Kərimdə açıq olaraq bildirilməmişdir.

### C. Qiyamətin Qopması (surun üfürülməsi)

Sur, qiyamətin qopmasını bildirmək və qiyamət qopduqdan sonra bütün insanların məhşər yerinə toplanmaq məqsədilə insanların dirilmələrini təmin etmək üçün İsrafil (ə.s) tərəfindən üfürülən buynuza bənzəyən bir alətdir. Peyğəmbərimiz bir hədisində, surun üfürülən bir alət olduğunu xəbər vermişdir. Ancaq bu alətin mahiyyəti haqqında dəqiq bir məlumat yoxdur. Bu sur, axirət həyatında olduğu kimi, dünyadakı digər surlara bənzəməz. Bizim Sur haqqında bildiyimiz onun üfürüldüyü zaman qiyamətin qopması və insanların təkrar dirilməsidir. Quran ayələrindən məlum olur ki, İsrafil (ə.s) Sura iki dəfə üfürəcəkdir. Sur ilk üfürüldüyü zaman, Allahın dilədikləri xaric, yerdə və göylərdə olan hər şey dəhşətdən sarsılacaq və hər şey məhv olacaq və qiyamət qopacaqdır. Sura ikinci dəfə üfürüldüyü zaman isə, insanlar diriləcək və məhşər yerində cəm olmaq üçün Rəbblərinin hüzuruna axışacaqlar. Belə ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur: “**Sur çalınacaq, Allahın göylərdə və yerdə olan istədiyi kimsələrdən başqa, dərhal hamı yıxılıb öləcək. Sonra bir daha çalınan kimi onlar qalxıb müntəzir olacaqlar!**”[223]

---

221. Kəhf 18, 94.
222. əl-Ənbiya 22, 96-97.
223. əz-Zumər 39, 68.

**D. Bəs (yenidən dirilmək)**

Qiyamətin qopmasından sonra, Sura ikinci dəfə üfürülməklə bütün canlı varlıqlar hesab üçün təkrar dirildiləcəklər. Təkrar diriliş həm bədən, həm də ruh ilə olacaqdır. Belə ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur: "**Ayələrimizi inkar edənləri oda atacağıq. Onların dəriləri bişdikcə, əzabı dadsınlar deyə, o dəriləri başqası ilə əvəz edəcəyik. Əlbəttə, Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!**"[224] Bu ayədən məlum olur ki, təkrar diriliş zamanı ruhla bərabər olaraq bədən də mövcud olacaqdır.

Qurani-Kərim inkar edənlərə Bəsin mümkin olduğunu və mütləq reallaşacağını belə sübut etməkdədir:

a) Yoxdan var etmənin, ikinci dəfə yaratmaqdan daha çətin olduğu: Qurani-Kərimdə Allah Təala varlıqları ilk dəfə necə yaratdığını bildirərək bunun ölümdən sonra da mümkin olduğunu bəyan etməklə ikinci dəfə təkrar yaratmağın Özü üçün asan bir iş olduğunu bildirmişdir. İlk başda insanı necə yaratdığını görməmiz üçün bizi yer üzündə gəzməyə təşviq etməkdədir. Allah Təala: "**Məgər insan onu nütfədən yaratdığımızı görmədimi ki, birdən-birə açıq düşmən kəsildi**"[225]-deyə buyuraraq bunun çətin bir iş olmadığını bildirməkdədir. Bir şeyi ilk dəfə yaratmaq, onu ikinci dəfə yaratmaqdan daha çətindir. İlk yaradılışı həyata keçirən Allah, əlbəttə daha rahat olan bəsi gerçəkləşdirəcəkdir

b) Bir şeyin bənzərini yaradan o şeyin özünü də yaradar: Qurani-Kərimdə göyləri və yeri yaradan Allahın, bunun bənzərlərini də yaratmağa qadir olduğu bildirilmişdir. Allah yağışı ölü torpağa verərək onu necə canlandırırsa, insanı da təkrar elə canlandıracaqdır.

c) Bir şeyin ziddini yaradan, o şeyin bənzərini də yaradar: Qurani-Kərimdə Allahın yaşıl ağacdan od çıxartdığı bildirilərək bunların ziddi və bənzərini də yaratmağa qadir olduğu xəbər verilməkdədir. Bədəvilər ağacları bir-birinə sürtərək od əldə edirdilər. Ayədə içində su olan yaşıl ağacdan odun əldə edilməsi misal verilərək Allahın insanların imkansız gördüyü şeyləri yaratdığı xəbər verilməkdədir. Yaratmağa qadir olan, bunun ziddini də yaratmağa qadirdir.

224. ən-Nisa 4, 56.

225. Yasin 36, 77.

### E. Həşr

Allah Təalanın insanları hesaba çəkmək üçün, ikinci dirilişdən sonra onları bir yerə cəm etməsi deməkdir. İnsanların toplanacaqları yerə Məhşər və ya Ərasat adı verilir. Belə ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur: “**Onlar gözlərini zəlilanə aşağı dikib səpələnmiş çəyirtkələr kimi qəbirlərindən çıxacaqlar. Kafirlər carçıya tərəf tələsərək: “Bu nə çətin bir gündür!-deyəcəklər.**”[226] Əlavə olaraq Qurani-Kərimdə məhşər zamanı günəşin yaxınlaşacağı və insanların tərləyəcəyi, insanların üç qrup şəklində yeriyərək, minərək və ya sürünərək həşr ediləcəkləri, bəzilərinin dəvələrə minəcəyi, bəzilərinin də kürəyində bir odun onu qovacağı xəbər verilmişdir.

### F. Əməl dəftəri

Allahu Təala Qurani-Kərimdə insanların açıq-gizli bütün söz və davranışlarını eşitdiyini və bunların Kiramən Katibin adlı mələklər tərəfindən yazıldığını, pis əməllər edənlərin əməllərini siccin adı verilən bir kitaba yazılacağını, hər insanın əməlinin boynuna asılacağını, qiyamət günü bunların bir kitab kimi önlərinə qoyulacağını və “Kitabını oxu! Bu gün sənə hesab sormaq üçün kitabın yetər” deyiləcəyini xəbər verməkdədir. Belə ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur:

“**Xatırla ki, sağında və solunda təsbit edən iki mələk oturmuşdur! Dediyi hər sözü onun yanında hazır durub gözləyən (iki mələk) vardır!**”[227]

“**Əməl dəftəri sağ əlinə verilən kimsə deyəcəkdir: Alın, əməl dəftərimi oxuyun! Mən öz hesabıma yetişəcəyimə inanmışdım! Əməl dəftəri sol əlinə verilən isə deyəcəkdir: Kaş əməl dəftərim mənə verilməyəydi! Hesabımın nə olduğunu bilməyəydim!**”[228]

“**Ya peyğəmbər! O gün hər ümməti diz çökmüş görəcəksən. Hər ümmət öz dəftərinə tərəf çağırılacaqdır. Bu gün sizə etdiyiniz**

226. əl-Qəmər 54, 7-8.
227. Qaf 50, 17-18.
228. əl-Haqqə 69, 19-20, 25-26.

**əməllərin əvəzi veriləcəkdir! Bu bizim kitabımızdır. O sizin əleyhinizə haqqı deyər. Biz sizin etdiyiniz əməlləri yazdırmışıq!**”[229]

Bu ayələrdən məlum olur ki, Allah insanların fərdi məsuliyyətlərindən başqa cəmiyyətə qarşı olan məsuliyyətlərindən də məsul tutmaq üçün ayrı bir dəftər tutulduğunu xəbər verir.

### G. Hesab və Mizan

Allahu Təala, ədalət və hikmətinin təcəllisi olaraq insanları axirətdə hesaba çəkər, onların əməllərini qiymətləndirər. Belə ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur: “**Biz göyü, yeri və onların arasında olanları boş-boşuna yaratmadıq. Bu, kafirlərin zənnidir. Vay cəhənnəm odunda yanacaq kafirlərin halına! Yoxsa biz iman gətirib yaxşı işlər görənləri yer üzündə fitnə-fəsad törədənlərlə eyni tutacağıq?! Yaxud Allahdan qorxub pis əməllərdən çəkinənləri günahkarlara tay edəcəyik?!**”[230]

İnsanlar əməl dəftərlərini aldıqdan sonra, Allah onları hesaba çəkəcəkdir. peyğəmbərimiz o gün insanlara beş şeyin soruşulacağını xəbər verməkdədir:

- Ömrünü harada keçirdin,

- Gəncliyini necə keçirdin,

- Malını haradan qazandın,

- Malını hara xərclədin,

- Bildiklərinlə əməl etdinmi?[231]

Hesab zamanı insan əməl dəftərindən başqa orqanları və yer üzü ona şahidlik edəcəkdir. Belə ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur: “**Qiyamət günü dilləri, əlləri və ayaqları etdikləri əməllər barəsində onların əleyhinə şəhadət edəcəkdir. O gün Allah**

229. əl-Casiyə 45, 28-29.

230. Sad 38, 27-28.

231. Tirmizi, Qiyamət, 1.

**onların cəzasını layiqincə verəcək və onlar Allahın açıq-aşkar bir haqq olduğunu biləcəklər!**”[232]

Bir gün peyğəmbər əfəndimiz **“O gün yer bütün xəbərlərini anladacaqdır”(**Zilzal 99,4.**)** ayəsini oxumuş və sonra

*- Yerin xəbərlərinin nə olduğunu bilirsinizmi?* Deyə soruşmuşdur. Əshab da

- Allah və elçisi yaxşı bilər dedikdən sonra Rəsulullah,

*- Yerin xəbərləri, hər qul və ümmətin etdiyi işlərə şahidlik etməsidir. “Bu gün bunu etdin, bu gün bunu” deməsidir*-deyə buyurmuşdur.[233]

Mizanın iç üzü və mahiyyəti bilinmir. Dünyadakı ölçü alətlərinin heç birinə bənzəmir. Bu tərəzidə yaxşılıqları pisliklərdən artıq olanlar qurtuluşa çatacaq, xəfif gələnlər isə cəhənnəmə gedəcəkdir. Belə ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur: “**Biz qiyamət günü üçün ədalət tərəzisi qurarıq. Heç kəsə əsla haqsızlıq edilməz. Bir xardal dənəsi ağırlığında olsa belə, onu gətirərik. Haqq-hesab çəkməyə Biz kifayətik.** ”[234]

### H. Şəfaət və Kövsər hovuzu

Şəfaət lüğətdə “qabağa düşüb onun işini etmək, bir vasitəçi ilə müraciət etmək, bir insanın bağışlanması üçün əfv istəmək” mənalarına gəlməkdədir.

Termin olaraq isə, şəfaət, günahı olan möminlərin günahlarının bağışlanması, günahı olmayanların isə daha yüksək mərtəbələr əldə etmələri üçün peyğəmbərlərlə, Allah qatında dərəcələri yüksək olanların Allaha yalvarmaları, dua etmələri və bağışlanmalarını istəməsidir. Axirət günü bütün peyğəmbərlərin Allahın izni ilə şəfaət etmələri haqdır və həqiqətdir. Allahın izni olmadan bir kimsənin şəfaət etməsi və ya Allahın istəmədiyi kimsəyə şəfaət edilməsi mümkin deyildir. Belə ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur:

232. ən-Nur 24, 24-25.
233. Tirmizi, Qiyamət, 7.
234. əl-Ənbiya 21, 47.

**"Onun izni olmadan heç bir şəfaət edən ola bilməz."**[235]

**"Onun izni olmadan Onun yanında kim şəfaət edə bilər?"**[236]

Kafir və Münafiq olanlara şəfaətin fayda verməyəcəyi də Qurani-Kərimdə bildirilmişdir: "**Şəfaət edənlərin şəfaəti onlara fayda verməz!**"[237]

Peyğəmbərimiz bir hədisində ümmətinin günahkarlarına şəfaət edəcəyini bildirmişdir: "*Şəfaətim ümmətimdən böyük günah işləyənlər üçündür*".[238] Bir başqa hədisdə də belə buyurmuşdur: "*Hər peyğəmbərin özünə xas, qəbul olan duası vardır. Mən bunu axirətdə ümmətimə dua etmək üçün saxlayıram.*"[239]

Hər peyğəmbərin qiyamət günü bir hovuzu olacaqdır. Bu hovuzdan o peyğəmbər və ümməti içəcəklər. Qiyamət günü peyğəmbərimizin də bir hovuzu olacaqdır. O, öz hovuzu haqqında belə buyurmuşdur: "*Kövsər hovuzuna ilk mən çatacağam. Mənə gələn o hovuzdan içər. Bəzi qruplar mənə gələcək ki, mən onları onlar da məni tanıyırlar. Sonra onlarla mənim aramda bir əngəl meydana gələcək. Mən, onlar mənim əshabımdır deyəcəm. Mənə, sən onların səndən sonra nələr icad etdiklərini bilmirsən, deyiləcək. Mən də, məndən sonra dinini dəyişdirənlər məndən uzaq olsun deyəcəm*"[240] "*Mənim hovuzumun bir kənarı bir aylıq yoldur. Suyu süddən daha bəyaz, qoxusu misqdən daha gözəl, qədəhləri də göydəki ulduzlardan daha çoxdur. Ondan bir dəfə içən əbədi olaraq susamaz.*"[241]

## X. Sirat

Sirat, cəhənnəm üzərinə uzadılan bir yoldur. Hər kəs bu körpüdən keçəcəkdir. Belə ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur: **"Sizdən elə bir kəs olmaz ki, oraya varid olmasın. Bu, Rəbbinin buyurduğu qəti bir hökmdür. Sonra Biz Allahdan qorxub**

235. Yunus 10, 3.
236. əl-Bəqərə 2, 255.
237. əl-Müddəssir 74, 48.
238. Əbu Davud, Sünnə, 21.
239. Buxari, Dəvət, 1; Müslim, İman, 86.
240. İbn Macə, Zühd, 36.
241. Tirmizi, Qiyamət, 14, 15.

**pis əməllərdən çəkinənlərə nicat verəcək, zalımları isə orada diz üstə çökmüş halda saxlayacağıq."**[242]

Möminlər, etdikləri əməllərə görə bəzisi sürətlə, bəzisi yavaş olaraq bu körpünü keçəcəkdir. Kafirlərin və günahkarların isə ayağı sürüşəcək və Cəhənnəmə düşəcək. Siratın necə bir şey olduğu haqqında səhih bir hədisə rast gəlmək mümkün deyil. Biz sadəcə onun mahiyyətini ancaq Allah bilər deməklə kifayətlənməliyik.

## III. HESABDAN SONRAKI HƏYAT

### A. Cənnət

Lüğətdə bağça, bitki və ağaclarla örtülü olan yer mənasına gələn cənnət, möminlərin əbədi olaraq qalacaqları, müxtəlif nemətlərlə bəzədilən axirət yurdudur. Cənnətdə həyat sonsuzdur. Qurani-Kərimdə cənnət çox gözəl təsvir edilmişdir. Belə ki, bu mövzu ilə əlaqədar olaraq Qurani-Kərimdə cənnəti təsvir edən ayələrdə buyurulur:

**"Rəbbinizin məğfirətinə və genişliyi göylərlə yer üzü qədər olan, müttəqilər üçün hazırlanmış cənnətə tələsin."**[243]

**"Onlar orada taxtlara söykənəcək, orada nə günəş (qızmar isti), nə də sərt soyuq görəcəklər"**[244]

**"Müttəqilərə vəd olunan Cənnətin vəsfi belədir: orada dadı dəyişməyən sudan irmaqlar, tami çönməyən süddən çaylar, içənlərə ləzzət verən şərabdan nəhrlər və təmiz baldan irmaqlar vardır."**[245]

**"Zəncəfil orada (Cənnətdə) bir çeşmədir ki, Səlsəbil adlanır."**[246]

242. Məryəm 19, 71-72.
243. Ali İmran 3, 133.
244. əl-İnsan 76, 13.
245. Muhəmməd 47, 15.
246. əl-İnsan 76, 18.

**“Onların dövrəsində həmişəcavan (xidmətçi) oğlanlar olacaqdır. Onları gördükdə, sanki səpilmiş inci olduqlarını zənn edərsən ”**[247]

**“Cənnətdə onlar üçün qızıl teştlər və qədəhlər dolandırılacaqdır. Orada onların ürəkləri istəyən və gözlərini oxşayan hər şey olacaqdır. Siz orada əbədi qalacaqsınız!”**[248]

**“Lakin Rəbbindən qorxanları bir-birni üstündə tikilmiş otaqlar gözləyir. Onların altından çaylar axar. Bu, Allahın vədidir Allah vədə xilaf çıxmaz!”**[249]

**“Onlar (mömin kişilər) və zövcələri kölgəliklərdə yumşaq taxtlara söykənmişlər.”**[250]

**“Şübhəsiz ki, Biz onları (huriləri) başqa cür yaradacağıq! Onları bakirə qızlar, Ərlərini sevən, həmyaşıdlar edəcəyik. Sağ tərəf sahibləri üçündür onlar!”**[251]

**“Onların yanında gözəl, baxışları yalnız ərlərinə dikilmiş zövcələr olacaqdır. Onlar, sanki örtülü (bağlı, heç bir əl dəyməmiş, qabığı içində təzə-təzə qalmış, ağappaq) yumurtadırlar.”**[252]

Dünya nemətlərinin heç birinə bənzəməyən cənnətdəki nemətlər, insanın ağıl və xəyalının təsəvvür edə bilmədiyi bir gözəlliyə və mükəmməlliyə sahibdir. Cənnətdəki nemətlərin ən böyüyü Allahın rizasını qazanmaq və Allahın cəmalını müşahidə etməkdir. Belə ki, Qurani-Kərimdə bu mövzu ilə əlaqədar olaraq belə buyurulur:

“**Allah mömin kişilərə və qadınlara altından çaylar axan cənnətlər və Ədn cənnətlərində gözəl məskənlər vəd buyurmuşdur. Onlar orada əbədi qalacaqlar. Allahın rizası isə (bunların hamısında) daha böyükdür. Bu, böyük qurtuluşdur (uğurdur)!**”[253]

247. əl-İnsan 76, 19.
248. əz-Zuxruf 43, 71.
249. əz-Zumər 39, 20.
250. Yasin 36, 56.
251. əl-Vaqiə 56, 35-38.
252. əs-Saffat 37, 48-49.
253. ət-Tövbə 9, 72.

**“O gün neçə-neçə üzlər sevinib güləcək, Öz Rəbbinə acaqdır.”**[254]

**B. Əraf**

Qurani-Kərimdə ərafda olanlar üçün “Əshabul-əraf” ifadəsi işlədilmişdir. Əraf surəsində, iman edib yaxşı əməl işləyənlərin cənnətlik olduqları, içlərindəki kin-küdurətdən təmizlənərək cənnətə gedəcəkləri, Allaha həmdü-səna etdikdən sonra cəhənnəm əhlinə, “Biz, Rəbbimizin bizə vəd etdiyini haqq olaraq gördük. Siz də Rəbbinizin sizə vəd etdiyini gerçək olaraq gördünüzmü?”-deyə soruşacaqları qeyd olunur. Onlar: “Bəli!”-deyə cavab verəcəklər. Elə bu zaman onların arasında bir carçı: “Allah zalımlara lənət eləsin!”-deyə səslənəcək, onların ikisinin arasında pərdə və Əraf üzərində isə insanlar vardır ki, onlar hamını üzündən tanıyıb cənnət əhlinə: “Sizə salam olsun!”-deyə müraciət edərlər. Bunlar çox istədiklərinə baxmayaraq hələ ora (Cənnətə) daxil olmamış (lakin Ərafda günahları təmizləndikdən sonra daxil olacaq) kimsələrdir. Onların nəzərləri cəhənnəm əhlinə çevrildiyi zaman: “Ey Rəbbimiz! Bizi zalımlar ilə bir etmə” deyərlər. Əraf əhlinin üzlərindən tanıdıqları adamlara müraciət edib: “Sizin nə yığdığınız mal-dövlət, nə də təkəbbürünüz fayda verdi,” - deyəcəkləri xəbər verilmişdir.[255]

Əraf əshabının kimlər olduğu haqqında fərqli görüşlər vardır. Əbu Huzeyfədən rəvayət edilən bir görüşə görə əraf əhli yaxşı əməlləri ilə pis əməlləri eyni olan insanlardır. Bunlar cənnət ilə cəhənnəm arasında bir müddət qaldıqdan sonra onlar haqqında hökm veriləcəkdir.[256]

Bəhs edilən ifadələrdən də məlum olur ki, əraf əbədi olaraq iqamət ediləcək yer deyildir. Allah Təala bu qrupa daxil olan insanları bir müddət burada saxladıqdan sonra onlar haqqında hökm verəcək və layiq olacaqları yerə göndərəcəkdir.

254. əl-Qiyamə 75, 22-23.
255. əl-Əraf 7, 42-48.
256. Əlmalılı H. Yazır, Haqq Dini Quran Dili, c.4, səh.43.

**C. Cəhənnəm**

Cəhənnəm: axirətdə kafir, müşrik və münafiqlərin əbədi qalacaqları əzab yeridir. Günahkar möminlər də öz günahlarının ölçüsündə orada cəzalandırılacaqlar.

“**Ey iman gətirənlər! Özünüzü və əhli-əyalınızı elə bir oddan qoruyun ki, onun yanacağı insanlar və daşlardır**”[257]

“**O gün Biz cəhənnəmə: Doldunmu? -deyəcək, o isə: Yenə varmı?- deyə cavab verəcəkdir.**”[258]

“**Onlar əlləri boyunlarına bağlı vəziyyətdə o atəşdən dar bir yerə atılacaqları zaman ölüm diləyərlər.**”[259]

“**O zaman ki, boyunlarında halqalar və zəncirlər olduğu halda cəhənnəmə tərəf sürüklənəcəklər, sonra odda yandırılacaqlar.**”[260]

“**Ayələrimizi inkar edənləri oda atacağıq. Onların dəriləri bişdikcə, əzabı dadsınlar deyə, o dəriləri başqası ilə əvəz edəcəyik. Əlbəttə, Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!**”[261]

“**Hələ onlar üçün (başlarına vurulan) dəmir toppuzlar da vardır. Oradan-qəmdən qurtulmaq istədikcə yenidən ora qaytarılar və: Dadın atəşin əzabını! (deyilər)**”[262]

“**Cəhənnəm əhli cənnət əhlinə müraciət edib: “Üstümüzə bir az su tökün və ya Allahın sizə verdiyi ruzilərdən bizə bir qədər ehsan edin!”-deyiləcək. Onlar isə: “Doğrusu, Allah bunları kafirlərə haram buyurmuşdur!”-deyə cavab verəcəklər.**”[263]

Allah cəhənnəmdə olan kafirlərə rəhmət etməyəcək və onlar Allahı görməkdən də məhrum olacaqlar. Cəhənnəm əzabı kafirləri hər tərəfdən əhatə edəcək və onlar orada əbədi olaraq qalacaqdır. Günahkar möminlər isə orada əbədi qalmayacaqdırlar.

257. ət-Təhrim 66, 6.
258. Qaf 50,30.
259. Furqan 25, 13.
260. əl-Mumin 40, 71-72.
261. ən-Nisa 4, 56.
262. əl-Həcc 22, 21-22.
263. əl-Əraf 7, 50-51.

# I. KƏLAM (ƏQAİD) ELMİ

## A. ƏQAİD

Əqaid, əqidə kəlməsinin cəmi olub, kökü əqd kəlməsidir. Əqd düyün bağlamaq, düyünləmək mənasındadır. İman termini ilə eyni məna ifadə edən etiqad kəlməsi isə bir şeyə könül bağlamaq, könüldən mənimsəmək deməkdir. Bu məna etibarıyla əqidə könüldən bağlanılan, könüldən təslim olunaraq inanılan şey deməkdir. İstilah olaraq, inanılması zəruri olan şey, yəni iman əsası deməkdir; bunun cəmi olan əqaid İslam dinində inanılması fərz olan xüsuslar və ya başqa ifadə ilə iman əsaslarıdır. İslam dinində iman əsaslarından bəhs edən elmə Əqaid elmi adı verilməkdədir.

İslam əqaidi İslam dininin əməli hökmlərindən deyil, etiqadi və nəzəri hökmlərindən bəhs edən bir elmdir. Əqaid elmi iman əsaslarını təhlil edərkən müxtəlif metodlardan istifadə edə bilər. İman əsasları şərh edilərkən Sələfiyyə kimi sadəcə nəqli əsas alaraq izah edə bilməklə yanaşı, kəlamcılar kimi ağlın işığında da məsələyə aydınlıq gətirilə bilər. Demək ki, Əqaid, hansı metodla olursa olsun iman əsaslarından bəhs edən elmin ümumi adıdır.

## B. KƏLAM ELMİ

### 1. Tərifi

Kəlamcılar bu elmi, bəzisi mövzusuna və bəzisi də qayəsinə görə ələ alaraq iki cür tərif etmişdirlər.

#### a. Mövzusuna görə tərifi

Kəlam, Allah Təalanın zatından və sifətlərindən, başlanğıcı və sonu etibarilə yaradılanların vəziyyətlərindən bəhs edən bir elmdir.

Məlum olduğu kimi bu tərifdə ilahiyyət və səmiyyət zikr edilmiş, lakin peyğəmbərlik zikr edilməmişdir. Axirət və ona bənzər məsələlər ancaq peyğəmbərin təbliği ilə bilindiyi üçün, səmiyyat zikr edilincə nübüvvət də buna aid olduğu düşüncəsiylə peyğəmbərlik müəssisəsinə xüsusi olaraq yer verilməmişdir.

Mərhum Ömər Nəsuhi Bilmən kəlam elminə çox gözəl və ətraflı bir tərif vermişdir: *“Kəlam elmi, Allah Təala həzrətlərinin zat və sifətlərindən, nübüvvət və risalətə aid olan məsələlərdən, başlanğıcı və sonu etibarilə yaradılanların vəziyyətlərindən İslam qanununu əsas tutaraq bəhs edən bir elmdir.”*

Kəlam elminə mövzusuna görə verilən təriflərdə iki xüsusiyyət diqqəti cəlb edir. Bunların birincisi başlanğıcı və sonu etibarilə yaradılanların vəziyyətləri, digəri isə İslam qanunu üzrə olmasıdır. Məlum olduğu kimi fizika, kimya, bialogiya və riyaziyyat kimi müsbət elmlər də yaradılanların hallarından bəhs edir. Lakin, bu elmlər insanı ələ alarkən başlanğıcı və sonu etibarilə yaradılanların vəziyyətlərindən bəhs etməz. Yəni “bu hadisələr necə meydana gəlir? Bunları meydana gətirən ilk səbəb nədir? İnsanın yaradılışındakı məqsəd və qayə nədir? Öldükdən sonra nə olacaq?” kimi suallara cavab verməz. Onlar sadəcə insanın hissiyyat orqanlarıyla görüb dərk edə biləcəkləri şeyləri izah edərlər. Kəlam elmi bu baxımdan pozitiv elmlərdən ayrılır və hadisələri başlanğıcı və sonu etibarilə incələyir.

Kəlam elmi İslam qanunlarına riayət etdiyi üçün fəlsəfədən ayrılır. Fəlsəfə də Kəlam elmi kimi Allahın zatından və sifətlərindən, başlanğıcı və sonu etibarilə yaradılanlardan bəhs edir. Ancaq fəlsəfədə ağıl əsas alınaraq məsələlər şərh edilir. Fəlsəfə ağla uyğun olmayan xüsusları nəql olaraq qəbul etmir. Kəlam isə nəqli əsas tutaraq məsələni izah etməkdədir. Kəlam hər nə qədər etiqadi mövzuların izah və isbatınında ağıla yer versə də, nəqli hərəkət nöqtəsi olaraq qəbul edir və İslam qanunlarına bağlı qalır.

**b. Qayəsinə görə tərifi**

İbn Xəldun Kəlam elmini belə tərif edir: *“Kəlam, dəlilləri ağılla, əqidələri imanla müdafiə edən, etiqadi mövzularda sələfin və əhli sünnənin təqib etdiyi yoldan üz döndərən bidətçiləri rədd edən bir elmdir.”*

Kəlam, müxaliflərin və bidətçilərin etirazlarına cavab verir, onları ağıl və nəql ilə susdurmağa çalışır. Buna görə də kəlam elmi münazərə və cədələyə olduqca çox əhəmiyyət verir. Əqaid və tövhiddə münaqişə və cədəl yoxdur. Ayələrdə və hədislərdə nə necə gəlmişsə, ona eləcə də inanılır və təslim olunur.

**2. Kəlam elminin məqsədi**

a. İnsanlardakı imanı təqliddən qurtarıb təhqiqi və sarsılmayan iman dərəcəsinə yüksəldir.

b. Kəlam elminin məsələlərini izah etməklə doğru yolu axtaran insanları irşad edir, inadçıları da dəlillərlə susdurur.

c. İman əsaslarını batil düşüncələrin şübhələrindən uzaqlaşdırır.

d. Digər dini elmlər bu elmə istinad edir. Çünki, kəlam elmi olmazsa digər dini elmlərin varlığından bəhs etmək olmaz.

e. İnsanlara əməllərində ixlaslı, niyyətlərində saf və inanclarında qüvvətli olmağa köməklik edir.

Bütün islami elmlərdə olduğu kimi kəlam elmi də bu məqsədləri gercəkləşdirərək əsl və yeganə məqsəd olan dareyn (dünya və axirət) səadətini əldə etməyə çalışır.

## II. KƏLAM ELMİNİN TARİXİ VƏ ONDAN BƏHS EDƏN ƏSƏRLƏRİ

### A. Əsri-Səadətdəki vəziyyət

Peyğəmbərimizin, peyğəmbərlik müddəti 23 illik müddət ərzində davam etmişdir. Bu dövr ərzində tədvin edilmiş hər hansı bir islami elmdən bəhs etmək mümkün deyildir. 23 illik bu müddət ərzində ayələr ehtiyaclara görə nazil olmuşdur. Bütün mövzularda olduğu kimi etiqadi mövzularda da problemi olan səhabə Rəsuli Əkrəmin yanına getmiş və problemin həlli üçün ondan köməklik istəmişdirlər.

Bu dövrdə gözlə görünən hec bir etiqadi problem yox idi. Çünki, vəhyin qaynağı (Peyğəmbərimiz) həyatda idi. Onun izah və irşadı ilə

bütün əshabın qəlbi rahatlıq tapırdı. Misal olaraq, Əbu Hüreyrənin rəvayət etdiyinə görə əshabdan bir qrup Peyğəmbərimizin yanına gələrək:

-Qəlbimizdə elə şeylər hiss edirik ki, hər hansı birimizin onu etiraf etməsi belə böyük günah olar, demişdirlər. Peyğəmbər Əfəndimiz:

-Həqiqətən elə şeylər hiss etdinizmi?

-Bəli deyincə Peyğəmbərimiz:

-Bu imanın əsl özüdür[264]-deyə buyurmuşdur.

Bu və ya buna bənzər ixtilaflı etiqadi sualların Peyğəmbərimizə soruşulması, inancı daha da qüvvətləndirmək və islami biliyi artırmaq üçündür. Bu baxımdan səhabələr vəhiydən başqa heç bir qaynağa ehtiyac hiss etmir və Peyğəmbərimizin cavabı ilə kifayətlənirdilər.

Göründüyü kimi Peyğəmbərimizin irşadından kənara çıxmayan səhabə, daha sonraları şiddətli münaqişəyə yol açacaq bəzi təvil və təşbihlərdən uzaq durmuş, Quranın qadağan etdiyi izahlardan çəkinmişdirlər.

### B. Etiqadi problemlərin meydana gəlməsinin səbəbləri və ilk ixtilaflar

Etiqadi mövzularda meydana çıxan ilk ixtilafları və ilk fikri hərəkətləri ələ almadan əvvəl bunların meydana gəlməsinin səbəblərini maddələr halında izah edək:

1. Xilafət mübahisələri: Peyğəmbərimizin vəfatından sonra müsəlmanlar xəlifə seçimi ilə qarşılaşmış və bu müvzuda ixtilafa düşmüşdürlər. Xilafət mövzusunun fiqhi bir məsələ olmasına baxmayaraq İmamiyyə, bu mövzunu imanın rükünlərindən hesab etmiş, əhli sünnə kəlamcıları da qələmə aldıqları kitablarında bu mövzuya yer vermişdirlər.

2. Müsəlmanlar arasında ortaya çıxan daxili savaşlar: Üçüncü xəlifə olan Hz. Osmanın şəhid edilməsi, Cəməl vaqiəsi və Sıffin savaşlarının ortaya çıxması müsəlmanlara böyük təsir göstərmiş və bu daxili savaşlar həlli çətin olan bəzi əqaid problemlərinin meydana çıxmasına səbəb olmuşdur. Misal olaraq, bu savaşlarda islamın böyük günah hesab etdiyi

264. Müslim, İman, 209; Əhməd b. Hənbəl, Müsnəd, I, 496.

adam öldürmək feli çox işlənmişdir. Böyük günah işləyən insanın iman baxımından vəziyyəti necə olacaqdır? Belə bir insan mömінmi, yoxsa kafirmi hesab ediləcək? İmanın sərhəddi və mahiyyəti nədir? Qətli icra edən insan bu feli hür iradəsi ilə həyata keçirirmi? Yoxsa buna məcbur idi? kimi suallar mübahisə edilməyə başlanmışdır.

3. Müsəlmanların müxtəlif din və mədəniyyətlərə mənsub olan millətlərlə əlaqə yaradması: İslam dini Hz. Peyğəmbərin zamanında Ərəbistan yarmadasından kənarda yayılmamışdı. Peyğəmbərimizin vəfatından sonra fəth edilən ölkələrdəki insanlar köhnə din, dil və mədəniyyətlərini unutmamış, müsəlman olduqdan sonra da köhnə düşüncələrdən xilas ola bilmədikləri üçün bunlar fikri hərəkətlərə səbəb olmuşdur. Ancaq bu səbəblər mübahisə mənbəyi olan məsələlərdə rol oynamamış, problemlərin üzə çıxmasını sürətləndirmişdir.

4. İslamın insanlara bəxş etdiyi düşüncə və vicdan azadlığı: Qurani-Kərimdə bir çox ayə bir başa və ya dolayı yol ilə oxumağı, düşünməyi və beləcə həqiqəti kəşf edərək onu qəbul etməyi əmr etməkdədir. İnsanların düşüncə və anlayışları bir-birindən fərqli olduğu üçün ölçü və metodda fərqliliklər, müxtəlif görüşlər, fikir ayrılıqları meydana gəlmişdir. Beləcə islamın düşüncə azdlığı ixtilafın meydana gəlməsindəki amillərdən biri olmuşdur.

5. Fəlsəfi kitabların tərcümə edilərək İslam dünyasında yayılması, elmsizlik səbəbilə meydana çıxan fikir ayrılıqları, şəxsi düşüncə və arzuların həyata keçirilməsi, insanların hər gün bir az daha Peyğəmbərlik nurundan uzaqlaşmaları və.s. kimi məsələlər etiqadi problemlərin meydana gəlmə amillərindəndir.

Hz. Peyğəmbərin vəfatından sonra xəlifə seçimi mövzusunda ortaya çıxan siyasi ixtilaf etiqadi olmadığı üçün istər səhabə dövründə, istərsə də Əsri-səadətdə əqaidə aid heç bir ixtilaf görünməmişdir. Ancaq səhabə dövrünün sonlarına yaxın Mabəd əl-Cühəni ilk dəfə Qədər haqqında danışmış və Qədəri inkar etmişdir.[265]

İlk etiqadi ixtilaflardan biri də Allahın sifətləri məsələsində meydana gəlmişdir. Cad b. Dirhəm Quranın məxluq olduğunu söyləmiş, Allahın kəlam sifətini inkar etmiş, Cəhm b. Saffan da onun görüşlərini alaraq sistemləşdirmişdir. Cəhm qulun iradəsini inkar edərək Cəbriyyə fikrini ortaya atan ilk şəxs olmuşdur.

265. Müslüm, İman, 6.

Əqaid mövzusunda meydana gələn ilk ixtilafları belə sıralamaq olar:

1. Allahın sifətləri.

2. Qədər.

3. Böyük günah işləyənin halı.

4. İmamət (siyasi ixtilaf).

**C. Kəlam elminin meydana çıxması və mötəzilə elmi-kəlamı**

Hicri I əsrin sonu ilə II əsrin başlanğıcındakı ilk fikri hərəkətlərdən sonra Mötəzilə məzhəbi fərqli bir fikri düşüncə ilə sistemləşdi. Mötəzilənin yaranması və mənşəyi haqqında müxtəlif nəzəriyyələr ortaya atılmışdır. Məşhur olan görüşə görə Mötəzilə, Vasıl b. Atanın Həsən Bəsrinin dərs məclisindən ayrılması ilə meydana çıxmışdır. Bir gün bir şəxs Həsən Bəsrinin məclisinə gəlmiş, böyük günah işləyəni Xaricilərin kafir, Mürciyyənin isə mömin hesab etmələrini bildirmiş və bu mövzuda onun fikirlərini soruşmuşdur. Həsən Bəsri suala cavab vermədən tələbələrindən Vasıl b. Ata onun fasiq olduğunu söyləmişdir. Daha sonra Həsən Bəsrinin məclisini tərk edərək dostu Amr b. Ubeyd ilə birlikdə düşüncələrini yaymağa çalışmışdır. Həsən Bəsri də “Qad itazələ annə Vasıl-Vasıl bizi tərk etdi”-deyə buyurmuşdur. Buna görə də onun məclisini tərk edənlər mənasında onlara Mötəzilə deyilmişdir.

Mötəzilə məzhəbi etiqadi mövzularda xüsusilə də ilahiyyət mövzularında nəql ilə bərabər ağla daha çox əhəmiyyət verir. Mütəşabeh ayələri ağıl ilə yorumlayırlar. İslam dinini ağıl ilə müdafiə etməyə çalışırlar. Mötəzilənin bu metoduna kəlam metodu adı verildi. O zamana qədər hər şeyi nəql ilə həll edən və nassa təslimiyyətlə bağlı olan sələf alimləri mötəziləni və kəlam metodunu tənqid edərək onun qarşısında yer tutdular. Yazdıqları müxtəlif risalələrdə də kəlamı bidat olmaqla günahlandırdılar.

**D. Əhli-sünnə kəlamçıları**

Mötəzilə elmi-kəlamının quruluşundan I əsr yarım sonra sələf alimlərindən Abdullah b. Küllab əl-Bəsri, Haris əl- Mühasibi və Əbül Abbas

əl-Kəlanisi kimi alimlər sünni etiqada yönələn etirazları cavablamaq üçün kəlamı öyrənmiş, sələf məktəbinin əqidələrini kəlam-elmi dəlillərilə dəstəkləmiş, məntiqçilərin düşüncələrini öyrənmişdirlər.

Nəhayət hicri IV əsrin əvvəllərində İmam Əbul-Həsən əl-Əşari əhli sünnə kəlamını təsis etmişdir. Əşari ömrünün 40 ilini Mötəzilə məzhəbinə bağlı olaraq keçirmiş və hətta bu məzhəbdə İmam dərəcəsinə yüksəlmişdir. Sonra "üç qardaş məsələsi"- deyə bilinən bir məsələdə müəllimi Əbu Əli əl-Cübbai ilə mübahisə etmiş, bu mübahisə zamanı onu susdurmuş, mötəzilədən ayrılmış və əhli-sünnə məzhəbinə girmişdir.[266]

Əşari daha sonra əhli-bidəti xüsusilə də Mötəziləni rədd etməyə çalışdı. Bir tərəfdən təşbehi qadağan edərkən, digər tərəfdən də Mötəzilənin inkar etdiyi 7 sifəti (Həyat, Elm, Qüdrət, İradə, Səm, Bəsər, Kəlam) isbat etdi. Tənzehdə sələf yoluna tabe oldu.

İmam Əşari Bəsrə və Bağdadda öz görüşlərini yayarkən, Mavəraun-Nəhrdə İmam Maturudi Əşariyyəyə paralel bir cərəyanın qurulmasını təmin etdi. Yazmış olduğu əsərlərilə böyük bir kəlamçı, müfəssir və fiqihçi olduğunu isbat edən Maturudi sələf ilə mötəzilə məzhəbi arasında yer alaraq sələfə daha yaxın bir yol təqib etmişdir.

---

266. Mötəziləyə görə qulun mənfəətinə və məsləhətinə ən uyğun olan şeyi yaratmaq Allaha vacibdir. Üç qardaş məsələsi Aslah prinsipi adı verilən bu prinsipə bağlıdır. Əşari müəllimi Cübbaiyə soruşur:
- Biri mömin digəri kafir, üçüncüsü də uşaq yaşda ikən ölən üç qardaş haqqında nə deyirsən?
- Mömin yüksək dərəcəyə çatır, kafir əzab görür, uşaq isə nə əzaba düçar olur nə də yüksək dərəcə əldə edir.
- Uşaq mömin qardaşının mərtəbəsinə getmək istəsə ona icazə verilərmi?
- Xeyr. Ona belə deyilər: Sənin qardaşın bu mərtəbəyə çox ibadət edərək getdi. Sənin isə ibadətin yoxdur.
- Əgər uşaq: Ya Rəbb! Günah məndə deyil, əgər sən məni yaşatsaydın, sənə itaət edərdim desə Allah Təala nə cavab verər?
- Allah Təala ona belə deyər: Sən yaşasaydın üsyan edəcəkdin. Mənim də əzabım sənə düçar olacaqdı. Bunu bildiyim üçün sənə xeyirli olanı etdim və səni yaşatmadım.
- O zaman kafir olan qardaş: Ey aləmlərin Rəbbi! Onun aqibətini bildiyin kimi mənim də aqibətimi bilirdin. Niyə onun üçün xeyirli olanı etdin, mənim üçün etmədin?- desə Allah Təala nə cavab verər?
- Vəsvəsəyə düşdün.
- Xeyr vəsvəsəyə düşmədim. Lakin şeyxin deyəcək sözü qalmadı. (Təftazani, Şərhül-əqaid, səh. 99).

İslam dünyasında əqaid mövzularında görüşləri əks etdirən dörd qrup diqqəti cəlb edir:

1. Əhli-sünnə elmi-kəlamının meydana çıxmasıyla tərafdarları gün keçdikcə azalan Sələfiyyə.

2. Əhli-sünnə kəlamçıları

3. Əhli-sünnədən kənar məzhəblər

4. İslam filosofları.

### E. Kəlam-fəlsəfə münasibətləri

Qədim Yunan alimlərinin ərəb dilinə tərcümə fəaliyyəti Əməvilərin son dövrlərində başlamış, Abbasi xəlifələrindən Mənsur, Harun ər-Rəşid və Məmunun dövrlərində bu fəaliyyət daha da inkişaf etmişdir. Məhz bu dövrlərdə olduqca çox Darul-hikmə təsis edilmişdir. Xəlifə Mənsurun dövründə məntiq elmi ərəb dilinə tərcümə edilmiş, Məmun zamanında da ilahiyyət, biologiya və əxlaqa dair fəlsəfə kitablarının ərəb dilinə tərcüməsi həyata keçirilmişdir. Bu tərcümə fəaliyyəti nəticəsində ilk İslam filosofları yetişmişdir. Bunlardan Əbul-Hükəma Yaqub b. İshaq əl-Kindi, Əbu Nasr əl-Farabi və İbni Sinanı zikr etmək olar. Zikr edilən filosoflar Aristoteli və Əflatunu xətasız bir rəhbər olaraq qəbul etmiş və onların görüşlərinə iki əlli sarılmışdırlar. Fəlsəfə hər mövzuda olduğu kimi ilahiyyat mövzularında da ağla tabe olaraq nəqlə əhəmiyyət verməz. Kəlam isə ağıla yer versə də nəqli hərəkət nöqtəsi qəbul edir.

Mütəqəddimun kəlamçılarının sonuncusu hesab edilən və Qəzzalinin müəllimi olan Əbul-Məali əl-Cüveyni Bakillaninin kəlamını daha da genişlətmiş, ağıl ilə bilinməsi mümkün olan ilahi sifətləri isbat etmiş, nəql ilə bilinməsi mümkin olan sifətləri (əl, üz, göz kimi xəbəri sifətlər) isə yox saymışdır. Ağıla zidd olaraq gördüyü nəqli şərh edən Cüveyni, sünni kəlamda yorum edən ilk şəxs olaraq qəbul edilir.

### F. Mütəəxxirin elmi-kəlamı

#### 1.Qəzzali və onun kəlam elmindəki yeri

Mütəəxxirun elmi-kəlamı filosof, fəqih və təsəvvüfçü olan Qəzzali ilə başlayır. O dövrə qədər kəlamçılar daha çox bidət firqələri ilə mücadilə

edirdilər. Qəzzalidən etibarən mücadilə və münaqişələr fəlsəfəçilərə qarşı başlamış, onların görüşləri rədd edilmişdir. Qəzzalinin kəlam elminə gətirdiyi yenilikləri belə sıralamaq olar:

a. Bakillaninin qəbul etdiyi inikasi ədilləyi rədd edərək dəlilin batilliyindən dəlil gətirilənin də batilliyini söyləməyin mümkün olmadığını etiraf etmişdir. Belə ki, inikasi ədilləni qəbul etmək məntiq elminə ziddir.

b. Məntiq elmini İslami elmlərdən hesab edərək “məntiq bilməyənin elminə etibar etmək olmaz”-deyə buyurmuşdur. Məntiq elmi əvvəlki kəlamçılara görə bəzi kəlami dəlillərə zidd hesab edilsə də, imani əqidələrin özünə zidd deyildir.

c. Qəzzalinin kəlam elminə gətirdiyi yeniliklərdən biri də fəlsəfi mövzulara çox yer verməsidir. İslam fəlsəfəsinin meydana çıxmasından sonra İslam aləmində iki görüş meydana çıxmışdır. Birinci qrupun görüşünə görə fəlsəfə ilə məşğul olan hər bir elm rədd edilmişdir. İkinci qrupun görüşünə görə isə fəlsəfədən nə əldə edilsə anında onu qəbul etmək və fəlsəfəçilər haqqında hüsni zənn bəsləmək lazımdır. Qəzzali bu iki qrupun da səhv yolda olduğunu görmüş və fəlsəfi elmləri təhlil etmişdir. O, fəlsəfəçilərin maraqlandığı riyaziyyat, məntiq, biologiya, ilahiyyat, siyasət və əxlaq elmlərini ayrı-ayrı dəyərləndirmişdir. Ona görə filosofların məntiq və riyaziyyat haqqındakı görüşləri doğrudur. Ancaq onların biologiya və xüsusilə də ilahiyyat mövzusundakı görüşləri zənn və şübhəli bilgilərdən ibarətdir. Bu baxımdan Qəzzali fəlsəfəçilərin iyirmi məsələdə xətalı olduqlarını bəyan etmişdir. Bu məsələlərdən üçündə onları təkfir etmiş, on yeddisində isə onları böyük xəta və bidətçiliklə günahlandırır.

Qəzzalinin fəlsəfəçiləri təkfir etdiyi üç məsələ bundan ibarətdir:

1. Aləmin qədimliyi: Fəlsəfəçilərə görə aləm zat etibarilə sonradan yaranmış, zaman etibari ilə qədimdir. Yəni Allah aləmdən zaman baxımından deyil, zat baxımından öncə gəlmişdir. Kəlamçılara görə isə Allahdan başqa qədim qəbul etmək tövhid inancına ziddir.

2. Allahın cüziyyəti bilməməsi: Fəlsəfəçilərə görə Allah cüziyyəti bilmir. Çünki, hadisələr dəyişkəndir. Hadisələr dəyişdiyi zaman ona aid olan bilginin və bilənin də dəyişməsi lazımdır. Əgər Allahın cüziyyəti bildiyi fərz edilirsə Allahın zatının da dəyişməsi lazımdır. Halbuki, Onun zatı hər cür dəyişmədən münəzzəhdir. Qəzzali belə bir düşüncəni Allahın sifətlərinə qarşı bir nöqsan olacağı qənaətindədir.

3. Həşrin cismani deyil, ruh ilə olacağı: Fəlsəfəçilərə görə axirət həyatı vardır. Ancaq bu həyat sadəcə ruh ilə olacaqdır. Çünki, cəsəd və maddə sonlu, ruhlar isə sonsuzdur. Əgər cəsədlər dirilsələr sonsuz olan ruhlara çatmazlar. Qəzzali bu görüşün açıq olaraq bildirilən nassa zidd olduğunu söyləmişdir.

Qəzzalinin İslam filosoflarını təkfir etməsi sonrakı kəlamçılar tərəfindən də mənimsənmişdir. Ancaq fəlsəfəçilərin bu üç nöqtədə təkfir edilə bilməyəcəyini etiraf edən kəlamçılar da olmuşdur. Qəzzalidən bir əsr sonra yaşayan İbni Rüşd “Təhafütü Təhafütil-fəlasifə” adıyla qələmə aldığı əsərində Qəzzalini tənqid etmiş və əvvəlki filosofların haqlı olduğunu müdafiə etmişdir. İslam filosofları ilə batinilərin xaricində olan bidət firqələrinə qarşı xoşgörülü davranan Qəzzali, onların təkfir edilməsinin yersiz olduğunu iddia ilə müdafiə edir.

**2. Fəlsəfə ilə qarışdırılmış kəlam dövrü**

Qəzzalinin açdığı və “fəlsəfi mövzulara kəlam elmində yer vermək” deyə ifadə edəcəyimiz bu dövrü özündən sonra gələn Şəhristani davam etdirmiş, əsərlərində çoxlu fəlsəfi məsələyə və dəlilə yer vermişdir. Daha sonra Fəxrəddin ər-Razi Qəzzalinin metodunu tamamlamış və bu mövzuda böyük əsərlər qələmə almışdır. Razidən sonra gələn Amidi isə Razinin metoduna tabe olmuş, hətta kəlamda fəlsəfi mövzulara Razidən daha çox yer vermişdir.

**3. Şərh və incələmə dövrü**

Hicri VIII əsrin ortalarından başlayaraq yaşadığımız əsrin əvvəlinə qədər davam edən bu dövr kəlam elminin təqlid, dayanma və geriləmə dövrüdür. Kəlam elminə aid əvvəlki əsərlərə şərh və haşiyələr yazılmış, yenidən düzənlənmişdir. Bu dövrün kəlamçıları fəlsəfə ilə kəlamı birləşdirmə metodunu davam etdirmişdirlər.

İslam aləmində fəlsəfə axımını dayandıran mütəəxxirun kəlam elmində, fəlsəfi mövzulara çox yer verilməməsinin iki səbəbi vardır:

a) Fəlsəfi məsələləri əvvəlcə müzakirə və şərh edib onun İslam əqaidinə zidd olan yönlərini tənqid etmək.

b) İslam əqaidinə zidd olmayan tərəflərindən -məsələləri izah və isbat edərkən- faydalanmaq və istifadə etmək.

### G. Yeni kəlam elmi dövrü

Mütəqəddimun və mütəəxxiruna aid olan kəlam kitablarımızda Allahın varlığı haqqındakı mövzulardan bəhs edilmişdir. Ancaq bu kitablardakı məlumatlar günümüzdəki inkar edən qruplara cavab verəcək elmi səviyyəyə malik deyildir. Deməк ki, Allahı, Peyğəmbəri, axirəti – daha açıq bir ifadə tərzi ilə – ateistlərə qarşı İslam əqaidini müdafiə edəcək yeni bir kəlam elminə ehtiyac vardır. Bu elmin mücadilə edəcəyi inkarçı qrupları belə sıralamaq olar:

1. Karl Marks və Engelsin inkişaf etdirdikləri Tarixi Maddəçilik (Materializm).

2. Darvinin Təkamül nəzəriyyəsi.

3. Aquste Comte tərəfindən ortaya atılan Pozitivizm.

4. Təbib Freud tərəfindən qurulan Freudizm.

Adları keçən və bunlara bənzər axınlara qarşı mücadilə etmək məcburiyyətində olan yeni kəlam elmi dövrünün əsas vəzifələrini belə təyin edə bilərik: “Yeni kəlam elmi, materializmi və fəlsəfi bir görüş olaraq pozivitizmi rədd edən, dinə qarşı çıxan bioloji və psixoloji tənqidləri (Darvinizm, Freudizm) cavablandıran, yeni fəlsəfi axımları tənqid etdikdən sonra müsbət elmi görüşlərdən də istifadə edərək Allahın varlığını isbat edən, İslamın əqaid mövzularını isbat və izah edərək İslamın müqəddəs saydığı şeyləri müdafiə edən bir elmdir.”

## III. ETİQADİ MƏZHƏBLƏR

Peyğəmbər əfəndimiz bir hədisində yəhudilərin 71, xristianların 72, ümmətinin də 73 firqəyə ayrılacağını və bu 73 firqənin birinin qurtulacağını, digərlərinin atəşdə olacağını xəbər vermişdir.[267] Bir çox alimlər hədisdəki rəqəmlərin həqiqi bir say olduğunu düşünmüş və məzhəbləri 73 rəqəminə çatdırmaq üçün əmək sərf etmişdirlər. Bəzi alimlər də rəqəmləri çoxluğu ifadə etmək baxımından məcazi olaraq qiymətləndirmiş və bunu ümmətin çoxlu qrupa ayrılacağını, bunlardan sadəcə birinin Rəsulullahın və əshabın yolun ilə gedərək qurtuluşa çatacağını, digər məzhəblərin də cəhənnəmə

267. Əbu Davud, Sünnə, 1; İbn Macə, Fitən, 17.

gedəcəyi mənasında şərh etmişlər. İslam tarixində və günümüzdə ortaya çıxan, eyni zamanda da çıxmağa davam edən məzhəblərin sayının çoxluğunu nəzərə alsaq, ikinci görüşün daha məqsədə uyğun olduğunun şahidi olarıq.

### A. Sələfiyyə

İlk alimlər, keçmiş İslam böyükləri mənasına gələn bu termin, iman əsaslarıyla əlaqəli mövzularda ayə və hədislərdəki ilk mütəşabihlər də daxil olmaqla kifayətlənib bunları olduğu kimi qəbul edən, təşbeh (Allahı yaradılanlara bənzətmək) və təcsime (Allahı cism olaraq qəbul etmək) düşməyən, təvil (bir başqa mənaya yozmaq) də etməyən əhli-sünnə topluluğuna verilən isimdir. Peyğəmbərimizin və səhabənin təqib etdiyi yolu olduğu kimi təqib edən zümrə Sələfiyyədir. Tabiun, məzhəb imamları, böyük müctəhidlər və hədisçilər Sələfiyyədəndir. Əşarilik və Matürudilik çıxana qədər sünni müsəlmanlarda hakim olan inanc sələf inancı idi. Sələfiyyənin diqqəti cəlb edən ən böyük xüsusiyyəti əqaid sahəsində ağıla rol verməməsi, ayə və hədislərlə kifayətlənməsi, mütəşabihləri təvil etmədən bunları Allahın bildiyini söyləməsidir. Sələfiyyənin mütəşabihlər mövzusundakı görüşünə belə bir misal vermək olar: Allah Təala bir ayədə "**Allahın əli onların əllərinin üstündədir**"[268]-deyə buyurur. Sələf bu ayəni belə qiymətləndirir: "Allah Təala ayədə əlin varlığını bildirməkdədir. Allahın əlinin olduğuna inanırıq və bundan hasil olan mənanı Allaha həvalə edirik. Bunu ancaq Allah bilir. Biz bunun mahiyyəti haqqında düşünmürük. Buna başqa bir məna da vermirik. Bu mövzuda sual da soruşmuruq."

Sələf inancının əsasları bunlardan ibarətdir:

**a. Təqdis**: Allahı zatına və isminə layiq olmayan xüsusiyyətlərdən münəzzəh qılmaq.

**b. Təsdiq**: Quran və səhih hədisdə Allah necə vəsfləndirilibsə, eləcə də qəbul etmək və inanmaq.

**c. Acizliyini etiraf etmək**: Ayə və hədislərdəki Allahın sifətləri ilə əlaqədar olan xəbərləri anlamadıqlarını, acizliklərini dərk edərək "bunları ancaq Allah bilir", deyə etiraf etmələri.

268. əl-Fətih 48, 10.

**d. Sükut**: Mütəşabih ayələr haqqında sual soruşmamaq.

**e. İmsaq**: Mütəşabih ayələr haqqında dil ilə şərh (təvil) etməmək.

**f. Kəff**: Belə ayələr haqqında qəlb ilə də düşünməmək, qəlbi bunlarla məşğul etməmək.

**g. Mərifət əhlinə təslim**: Xalqın, bilmədiyi şeylər haqqında Hz. Peyğəmbərin, səhabələrin və mütəxəssis alimlərin bildiyini qəbul etmək.

İlk dövrlərdə səmimi və zahidanə həyat tərzi keçirən, Quran ve sünnəyə uyğun olaraq yaşayanlara sələfi deyildiyi halda, günümüzdə illərdən bəri davam edən islami düşüncə və həyat tərzini rədd edərək "sələfi" olduğunu iddia edənlər vardır. Lakin dövrümüzdəki bu insanlarla əvvəlkilər arasında düşüncə tərzi etibarilə bir çox fərqliliklər vardır.

**B. Matürudiyyə**

Etiqadda Məhəmməd b. Məhəmməd b. Mahmud Əbu Mənsur əl-Matürudiyə tabe olanların meydana gətirdiyi məzhəbə Matürudiyyə məzhəbi deyilir. Matürudi, Türkistandakı Səmərqənd şəhərinin bir kəndinin adıdır. Əbu Mənsur təxminən 238/944-cü illərdə orada anadan olmuşdur. Özü əslən türkdür. Həyatı haqqında çox məlumat olmasa da, əsərlərinə nəzər saldığımızda Onun kəlam, məzhəblər tarixi, fiqh üsulu və təfsir sahəsində görkəmli şəxsiyyət olduğu anlaşılar. O, əməldə İmamı-azam Əbu Hənifəyə bağlı və hənəfi bir ətraf mühitdə yetişmişdir. Onun "Təvilatül-Quran" və "Kitabüt-Tövhid" adlı əsərləri bizə qədər gəlib çatmışdır.

Matürudilik, əqaid sahəsində ayə və hədislə birlikdə dinin anlaşılması üçün ağlın da lüzumunu qəbul etmiş, İmam Matürudidən sonra kəlam metodunu getdikcə inkişaf etdirmişdir. Bəzi mövzularda da ağıla daha çox əhəmiyyət verdiyi üçün Əşariliklə Mötəzilə arasında yer almışdır.

Matürudiyyə, daha əvvəl zikr etdiyimiz əhli-sünnənin əsas prinsiplərində Əşarilər ilə eyni görüşü mənimsəməklə yanaşı, bəzi mövzularda özünə xas fərqli görüşlərə də sahibdir. Bu görüşlərdən bəzilərini belə sıralamaq olar:

a. Dinin təbliği olmasa da insan ağılla Allahı tapa bilər.

b. Yaxşı və pisi, gözəl və çirkini ağılla tapmaq olar. Allah Təala bir şeyi yaxşı olduğu üçün əmr etmiş, çirkin olduğu üçün də qadağan etmişdir.

c. Qulda müstəqil bir cüzi iradə vardır. Qul öz iradəsi ilə öz seçimini həyata keçirir, Allah da qulun seçiminə görə feili yaradır.

d. Allah Təalanın digər sifətləri kimi təkvin (yaratma) sifəti də əzəlidir.

e. Allah insanın gücünün çatmayacağı şeyi ona verməz.

f. Allahın sifətlərində mütləq bir səbəb və hikmət vardır. Ancaq qul bu səbəb və hikməti hər zaman dərk etməyə bilər.

**C. Əşariyyə**

Etiqadda Əbul-Həsən Əli b. İsmayıl əl-Əşarinin görüşlərini mənimsəyən əhli-sünnə məzhəbinə Əşariyyə deyilir. İmam Əşari hicri 260 tarixlərində Bəsrədə anadan olmuş, 40 yaşına qədər mötəzilə məzhəbinə bağlı olmuş, sonra “üç qardaş məsələsi”- deyə bilinən bir məsələdə müəllimi Əbu Əli əl-Cübbai ilə münaqişə və mübahisə edərək ondan ayrılmış və Əşariliyi qurmuşdur. O, 324/ 936 tarixində Bağdadda vəfat etmişdir.

İmam Əşari əsərlərində mötəzilə və digər bidət məzhəblərini rədd etmişdir. Allah Təalanın əzəli sifətlərinin olduğunu qəbul etmiş, etiqadi mövzularda ağıla da əhəmiyyət verərək ayə və hədislərin yanında ağıl ilə də dəlillər işlətmişdir. Ən məşhur Əşari kəlamçıları Bakillani, Cüveyni, Qəzzali, Şəhristani, Amidi, Fəxrəddin Razi, Qadi Beyzavi, Təftəzani və Cürcanidir.

Əşarilik daha çox mötəziləyə qarşı bir mövqe tutaraq meydana gəlmiş, fəlsəfəyə qarşı tezist olaraq davam etmişdir. Əşari alimləri zamanla təvilə çox yer vermişdirlər. Bəzən də kəlamda yeniliklər və dəyişikliklər etmiş, kəlam elmini fəlsəfə ilə rəqabət edəcək bir gücə qovuşdurmuşdurlar. Əşariyyə məzhəbi də əhli-sünnənin əsas prinsiplərini qəbul etməklə yanaşı bəzi yerlərdə Matürudilikdən ayrılmış, özünə xas görüşləri ilə fərqlənmişdir. Bunları qısa olaraq belə xarakterizə etmək olar:

a. Dini təbliğin gəlib çatmadığı insanlar ağıl ilə Allahı tapmaq və Ona iman etməklə mükəlləf deyildir.

b. Yaxşı və pisi, gözəl və çirkini ağılla deyil şəriət ilə bilinir. Bir şey Allah əmr etdiyi üçün gözəldir, Allah qadağan etdiyi üçün çirkindir. Feilin özündə gözəllik və çirkinlik yoxdur.

c. Qulda müstəqil bir cüzi iradə yoxdur. Qulun cüzi iradəsi Allahın iradəsinə bağlıdır. Qul istəyər Allah da dilərsə yaradar, dilərsə yaratmaz.

d. Allah Təalanın ayrıca əzəli bir Təkvin sifəti yoxdur. Bu sifət qüdrət sifətinin içindədir.

e. Allah, qulun gücünün çatmayacağı şeyi ona yükləyə bilər.

f. Allahın sifətlərində mütləq bir səbəb və hikmət ola da bilər, olmaya da bilər.

**D. Mötəzilə**

Ayrılanlar, uzaqlaşanlar, bir tərəfə çəkilənlər mənasına gələn Mötəzilə, böyük günah işləyən insanın küfr ilə iman arasında bir mərtəbədə olduğunu söyləyərək Həsən Bəsrinin dərsini tərk edən Vasıl b. Ata ilə ona tabe olanların meydana gətirdiyi məzhəbin adıdır. Mötəzilə ağıla üstünlük verən bir məzhəbdir. Bu baxımdan onlar məntiq qaydaları ilə ziddiyyət yaradan ayə və hədisləri başqa mənalarda şərh etmişdirlər. Yəni ağıla daha çox üstünlük vermişdirlər. Kəlam elmi ilk olaraq Mötəzilənin əlində olmuşdur. Görüşlərini başda Şiə olmaq üzrə başqa məzhəblər də mənimsəmişdirlər. Mötəzilə məzhəbinin görüşləri beş əsasda sistemləşmişdir. Buna “əl-Usülül-Xəmsə” (beş əsas) adı verilir. Bu əsaslar bunlardan ibarətdir:

**a. Tövhid**: Allahı zat və sifətləri etibarıyla bir olaraq qəbul etməkdir. Bu anlayışdan hərəkət edən Mötəzilə, Allahın əzəli sifətlərini əzəli varlıqların çoxaltması düşüncəsiylə inkar etmiş, Allahın kəlam sifətini məxluq hesab etmiş, Allahın axirətdə insanlar tərəfindən gözlə görülməyəcəyini iddia etmişdir.

**b. Ədalət**: Mötəziləyə görə qullar feillərini azad iradə ilə edirlər. Bu feillərin yaradılmasında Allahın heç bir müdaxiləsi yoxdur. Əgər bu feilləri Allah yaradmış olsaydı, qulun o feildən ötrü cəza görməsi ədalət deyil, zülm olardı. Mötəzilə bu görüşləri ilə ilahi qədəri inkar etmiş, qulun qədərini özünün yazdığını söyləmişdir. Mötəzilənin ədalət sifəti haqqında

bəyan etdikləri düşüncələr Qadiriyyədən təsirlənməsinin bir təzahürüdür. Yəni ədalət prinsipinə görə qul üçün ən uyğun olanı yaratmaq Allah üçün vacibdir.

**c. Vad və vaid**: Yaxşılıq edənə mükafat, pislik edənə isə cəza vermək Allah üçün zəruridir. Bu baxımdan günah işlədikdən sonra tövbə etməyən qulu, Allahın bağışlaması və peyğəmbərin şəfaət etməsi mümkün deyildir.

**d. Mənzilə beynəl-mənzilətеyn**: Böyük günah işləyən şəxs nə mömin, nə də kafirdir. İman ilə küfr arasında fisq deyilən bir mərtəbədədir. Əgər tövbə etmədən ölsə, əbədi cəhənnəmdə qalacaq, tövbə edərsə mömin olaraq cənnətə girəcəkdir.

**e. Əmr bil-maruf vən-nəhy anil-münkər**: Yaxşılığı etdirmək və pisliyin qarşısını almaq bütün müsəlmanlara fərzdir.

Mötəzilə etiqadda bu görüşlərə sahib olmaqla yanaşı, əməldə hənəfi məzhəbinə bağlıdır. Mötəzilə öz içində çoxlu qrupa ayrılmışdır. Bu qrupların 20-yə yaxın olduğunu bildirən tarixçilər vardır.

### E. Şiə

Lüğətdə qrup, topluluq, tərəfdarlar, köməkçilər mənasına gələn Şiə, termin olaraq dördüncü xəlifə Hz. Əlinin tərəfini tutanların və Onun digər bütün səhabələrdən üstün olduğunu qəbul edənlərin meydana gətirdiyi məzhəbdir.

Şiəyə görə Hz. Əli Rəsulullahdan sonra müsəlmanların ən üstünüdür. Xəlifəlik və imamlıq insanların həll edəcəyi bir məsələ deyildir. Bu baxımdan Hz. Peyğəmbər özündən sonra kimin xəlifə olacağını izah etmişdir. Bu da Hz. Əlidir. İmamlar da peyğəmbərlər kimi böyük və kiçik günahlardan qorunmuşdurlar. Böyük günah işləyən şəxslər tövbə etmədən ölsə əbədi olaraq cəhənnəmdə qalacaqlar. Şiə öz içində iyirmiyə yaxın qrupa ayrılmışdır. Əsas qolları Keysaniyyə, Zeydiyyə, İmamiyyə, Ğaliyyə və Batiniyyədir.

**1. Keysaniyyə**

Xilafətin Hz. Əlidən sonra onun Havlə adındakı cariyədən olan oğlu Məhəmməd İbnul-Hənəfiyyənin haqqı olduğunu müdafiə edən qrupdur. Bu məzhəb, Allah Təalanın bildiyi bir şeyin sonradan tərsinin meydana gəldiyini, insanlar öldükdən sonra ruhlarının başqalarına keçdiyini, məzhəbin qurucusu Muxtar Saqafinin peyğəmbərliyini iddia etdiyi üçün kafir sayılmışdır. Hətta tarixçilərin çoxu Keysaniyyəni Ğaliyyədən hesab edirlər.

**2. Zeydiyyə**

Hz. Hüseynin nəvəsi Zeyd b. Əliyə bağlı olan Şiənin bir qoludur. Görüşlərinə görə Şiənin əhli-sünnəyə ən yaxın olan qoludur. Zeydiyyəyə görə Hz. Peyğəmbərdən sonra ən fəzilətli şəxs Hz. Əlidir. Ancaq ən fəzilətli bir insan olduğu halda səhabələrin seçdiyi insanın xəlifəliyi keçərlidir. Zeydiyyə, əqaid mövzularında mötəzilənin təsirində qaldığı üçün, böyük günah işləyən insanın tövbə etmədən öldüyü təqdirdə əbədi cəhənnəmdə qalacağını söyləmişdir.

**3. İmamiyyə**

Hz. Peyğəmbərdən sonra on iki şəxsi imam olaraq tanıdıqları üçün "İsnaaşəriyyə-onikicilər"; altıncı imam Cəfər Sadiqi fiqhdə imam qəbul etdikləri üçün Cəfəriyyə adıyla da zikr edilən bu qrup, ən çox nümayəndəsi olan Şiə qrupudur. Yuxarıda Şiənin ümumi görüşləri arasında zikr etdiyimiz görüşlər eyni zamanda imamiyyənin görüşüdür. İmamiyyəyə görə on iki imam bunlardır: Hz. Əli, Hz. Həsən, Hz. Hüseyin, İmam Əli Züynülabidin, İmam Məhəmməd Bəkir, İmam Cafəri Sadiq, İmam Musa Kazım, İmam Əli Rıza, İmam Məhəmməd Taki, İmam Əli Naki, İmam Həsən Əskəri və İmam Məhəmməd Mehdi. On ikinci imam balaca yaşlarında yox olmuş və bir daha geri dönməmişdir. Qiyamətin qopmasına yaxın gələcək qurtarıcı (Mehdi) odur.

**4. Ğaliyyə**

Sərhəddi keçənlər mənasına gələn bu kəlmə, müsəlman olduqlarını söylədikləri halda İslamın əsaslarından olduğu bilinən xüsuslardan bir və ya bir neçəsini inkar edən qruplara verilən isimdir. Ğaliyyənin ilk qurucusu Yəmənli bir yəhudi dönməsi olan Abdullah b. Səbədir. O, Hz. Əlinin

tanrı olduğunu iddia etmiş və bu səbəblə də Mədainə sürgün edilmişdir. Ğaliyyə müxtəlif qollara ayrılmaqla yanaşı, ümumi xüsusiyyətləri: imamları tanrılaşdırmaq, Allahın ruhunun imamlara hülul etdiyini söyləmək, imamların və ya firqə qurucularının peyğəmbər olduqlarına inanmaq, qiyaməti inkar etmək, tənasühə inanmaq, haramları halal, halalı da haram saymaq, Quranın dəyişdirildiyinə inanmaq və peyğəmbərin əshabını kafir saymalarıdır.

Bu inanclarına görə Ğaliyyə dindən kənar bir qrupdur. Günümüzdə müstəqil olaraq yaşamasalar da, dəyişik formada yaşamaqdadırlar. Misal olaraq Babilik, Bahailik, Kadiyanilik, Dürzilik, Nusayrilik kimi. Onlar bu gün daha çox Hindistan, Pakistan, Suriya, Lübnan, İsrail, Yəmən, Uqanda və Amerikada yaşamaqdadırlar.

**5. Batiniyyə**

İsmailiyyə, Səbiyyə, Zənadikə və Karmatilər olaraq da bilinməkdədir. Tarixçilərin çoxu Batıniliyi Ğaliyyədən hesab edirlər. Görüşləri dindən uzaq, dinə ziddir. Mənası açıq olan ayələri belə səhv şərh edərək avam və bilgisiz insanları aldadırlar.

**F. Xariciyyə**

Bu məzhəb Hz Əli ilə Müaviyə arasında davam edən Sıffın savaşından sonra xəlifənin təyin edilməsiylə əlaqədar olaraq xəlifənin təyin edilməsi işi hakimə həvalə edilincə meydana çıxmışdır. Hz Əlinin ordusunda olanlardan bəzi insanlar onu tərk edərək ordudan ayrılmış və Hz. Əliyə üsyan etmişdirlər. Məhz bu səbəblə üsyan edənlərə, qarşı gələnlər mənasında Xariciyyə deyilmişdir. Xaricilər hakim məsələsini daha da qabardaraq bu işin günah olduğunu söyləmiş və hər böyük günah işləyənin dindən çıxdığını buyurmuşdurlar. Buna görə də onlar Hz Əliylə mübarizə aparmış və sonunda Onu şəhid etmişdirlər.

Xaricilərə görə xəlifə seçmək müsəlmanlar üçün vacib deyildir. Dövlət başçısız da ola bilər. Günah işləyən dövlət başçısına itaət edilməz və vəzifəsi əlindən alınar. Onların bu görüşləri İslam cəmiyyətində anarxiyanın ilk toxumları olmuşdur. Yenə xaricilərə görə əməllər imanın bir parçasıdır. Əməli tərk edən və ya böyük günah işləyən şəxs mömin deyil kafirdir.

Bu baxımdan onlar Osman bin Avfan, Əli bin Əb Talib, Müaviyə bin Əbi Sufyan, Cəməl və Sıffin savaşında iştirak edənləri günahkar hesab edərək təkfir edirlər. Xaricilərdən ən insaflı və əhli sünnəyə ən yaxın olan İbaziyyə zamanımıza qədər məzhəb olaraq yaşamışdırlar. İbazilər daha çox şimali Afrika, Madaqaskar və Zəngibarda yaşayırlar.

**G. Mürciə**

Ümid verənlər, təxir edənlər mənasına gələn bu kəlmə, Xariciyyə və Mötəzilənin böyük günah mövzusundakı görüşlərinə qarşı rəy bildirmək məqsədi ilə meydana çıxan və böyük günah işləyənin hökmünün Allaha aid olduğunu söyləyərək ümid verən və ya hökmü axirətə saxlayaraq gecikdirən şəxslərin meydana gətirdiyi məzhəbdir. Mürciəyə görə əməl imanın bir parçası deyildir. İmandakı artma və əksilməni qəbul etmirlər. Mürciəyə görə Allah vədindən əsla dönməz. Ancaq təhdiddən dönə bilər. Bu məzhəb də digər məzhəblər kimi müxtəlif qollara ayrılmışdır.

**H. Müşəbbihə və Mücəssimə**

Təşbeh lüğətdə bənzətmək deməkdir. Müşəbbihə də bənzədənlər mənasına gəlir. Onların bu ismi almalarının səbəbi inanclarına görədir. Çünki, onlar Allahın insana və yaradılanlara bənzədiyini, insanlar kimi Allahın da orqan və bədən üzvlərinə sahib olduğunu qəbul edirlər.

Mücəssimə də Allahı cism hesab edən və cismlər kimi qəbul edən məzhəbə verilən addır.

**X. Cəbriyyə**

Bu məzhəbin banisi Cəhm b. Saffandır. Bu baxımdan cəbriyyəyə Cəhmiyyə də deyilir. Cəbriyyə məzhəbi mötəzilənin tam ziddidir. İnsanda hür iradənin varlığını inkar edərək, İnsanın külək qarşısındakı quru bir yarpağa bənzədiyini, etdiyi işləri məcburi olaraq icra etdiyini qəbul edirlər. Bu gün də iradə, qədər və qəza məsələlərini yaxşı dərk etməyən bir çox insan bilərək və ya bilməyərək bu məzhəbin görüşünü mənimsəmişdir. Avropalılar bu məzhəbə Fatalizm deyirlər. Cəbriyyə, cənnət və cəhənnəmin

dünya kimi müvəqqəti olduğuna, axirətdə Allahın gözlə görülməyəcəyinə, Allahın kəlamının sonradan olduğuna inanır.

## IV. KƏLAM TERMİNİ OLARAQ BİDƏT[269]

Bidət, nümunəsi və bənzəri olmadan meydana gətirilən, dində sonradan uydurulan şey deməkdir. Əhli-bidət və əhli-dəlal isə əqaid sahəsində Rəsulullahın sünnəsini tərk edən, Rəsulullahın və əshabın əqaid sahəsindəki təqib etdikləri yoldan ayrılan və bidətə düşən qrup deməkdir. Bidət sünnənin ziddidir.

Əhli-bidətin xüsusiyyətlərini tanımaq üçün onların əsas xüsusiyyətlərini belə sıralamaq olar:

1. Səhabənin arxasınca gedən, müctəhid alimlərin görüşlərinə tabe olan müsəlmanların çoxundan ayrılmaq.

2. Mənası açıq bir şəkildə bilinən muhkəm ayələri bir kənara qoyaraq, mənasını ancaq Allahın bildiyi mütəşabih ayələr haqqında şərh edib onlara tabe olmaq.

3. Kitab və sünnəyə tabe olmaları lazım olduğu halda, etiqadi mövzularda öz arzu və düşüncələrinə tabe olmaları.

## V. HÖKMLƏR, METODLAR

### A. HÖKMLƏR

Hökmlər, mənbələrinə görə: 1. Dini hökmlər. 2. Ağıl ilə verilən hökmlər olmaq üzrə iki qismə ayrılır.

#### 1. Dini Hökmlər

Əhkamı ilahiyyə, əhkamı şəriyyə də deyilən dini hökmlər naslardan çıxarılan hökmlərdir. Dini hökmlər ya Allahın varlığı kimi bir başa insanın

269. Ətraflı məlumat üçün İ.A. Bidət md. baxın

qavrayacağı hökmlər ola bilər, ya da namazın fərz olması kimi anlaşılması dinin bildirməsinə bağlı ola bilər. Dini hökmlərin mənbəyi nasslardır. Yəni Kitab, sünnə, icma və qiyasdır. İcma və qiyas ilk ikisinə tabedir. Sünnə də kitabın təfsiri mahiyyətində olduğu üçün kitaba “əslul-üsul” deyilmişdir.

Dini hökmlər üç qrupa ayrılır. Əməl (praktik) ilə əlaqəli olmayan hökmlərə əsli və ya etiqadi hökmlər; əməl ilə əlaqəli olanlara da əməli və fəri hökmlər deyilir. Qəlb və vicdanla əlaqəli olan dini hökmlərə də əxlaqi hökmlər deyilir.

**a. Etiqadi hökmlər**

İslam dininin nəzəri hökümlərini meydana gətirən etiqadi məsələlər altı əsasda toplanmışdır. Bunların içində Allaha və Peyğəmbərlərə iman kimi mövzuları ağıl ilə izah və isbat etmək mümkün olduğu halda, mələklərə və axirətə iman kimi mövzularda ağlın irəli sürdüyü fikirlərə deyil, sadəcə nəqlə (ayə və hədis) müraciət edilir. Lakin belə məsələlər də tamamilə ağıla zidd olmayıb, ağlın fikirlərinə uyğun düşür.

Etiqadi hökmlərdə bəzi şərtlər axtarılır:

1. Etiqadi hökmlərin qəti olması, dəqiq məlumat verməsi lazımdır. Bu səbəblə bir hökmün etqadi mövzularda birbaşa dəlil ola bilməsi üçün ya Qurani-Kərim ayəsi və ya mütəvatir bir hədis olması lazımdır. (Qətiyyət)

2. Yenə etiqadi hökümlərin dəlil olması üçün ayələrlə mütəvatir hədislərin ifadə etdikləri məna qəti olmalıdır. Bir başqa məna ifadə etmə ehtimalı olmamalıdır. (Bədahət-açıqlıq)

3. Etiqadi hökümlər zamana, yerə, fərd və cəmiyyətlərə görə dəyişməyən, daim sabit qalan hökm olmalıdır. Bu səbəblədir ki, bütün peyğəmbərlər iman əsaslarında birləşmişdirlər. İlk peyğəmbər Hz. Adəmin etiqadı nə isə ondan sonra gələn peyğəmbərlərin etiqadı da odur.

4. Etiqadi hökmlər bölünməzdir. Yəni bir şəxs Allahın varlığına inanıb, mələklərə inanmazsa iman etmiş olmaz. Etiqadi hökmlərin əsli, cövhəri Allahın varlığı və birliyidir. Buna görədir ki, kəlamçılar Allaha imana “əslül-üsul” adını vermişdirlər. Etiqadi hökmlərlə kəlam və əqaid elmi məşğul olur.

**b. Əməli hökmlər**

Mükəlləf olan şəxslərin icra edəcəkləri praktik işlər və vəzifələr demək olan əməli hökmlər iki yerə ayrılır:

1. İbadətlər: İnsanın fikrini, ruhunu, iradəsini tərbiyə edir. İbadətlərin ruhu ixlasdır. İbadətlər icra edilirkən dünyəvi mənfəət axtarılmaz. Ancaq Allahın rizasını qazanmaq üçün ibadət edilir. İbadətlərin qaynağı kitab, sünnə və bunlara bağlı olan icma və qiyasdır. İbadətlər ancaq Allah üçündür, artmaz və əksilməz. Zaman, adət və ənənələrin dəyişməsilə dəyişməzdir.

2. Müəmalat: İnsanlar arasındakı hüquqi, bəşəri və sosial münasibətləri tənzimləyən hökmlərdir. Müəmalatın ruhu ədalətdir. Əsasları Quran və sünnədə mövcuddur. Müəmalat ilə əlaqəli mövzularda ictihad etmək mümkündür. Belə hökmlər -Quran və sünnəyə zidd olmamaq şərtilə-zaman, məkan, adət və.s. dəyişməsilə dəyişə bilər. Əməli hökmlərlə fiqh və İslam hüququ elmi maraqlanır.

**c. Əxlaqi hökmlər**

İnsanların öz aralarında və digər canlılarla olan münasibətlərini tənzimləyən, əxlaq qaydalarını göstərən, nəfsin tərbiyə olunmasıyla məşğul olan hökmlərdir. İslam əxlaqına aid olan hökmlər kitab və sünnədə geniş olaraq izah edilmişdir. Əxlaqda “Allahın əmrinə hörmət, yaratdıqlarına mərhəmət, yaradılanları yaradana görə xoş qarşılamaq” əhəmiyyətli bir əsasdır. Əxlaqi hökmlərə qəlbi və vicdani hökmlər də deyilir. Belə hökmlərlə əxlaq və təsəvvüf elmi məşğul olur.

**d. Dini hökmlərin etiqadi cəhəti**

İslamın qoyduğu hökmlər hər nə qədər üç fəsildə araşdırılsa da və onlar etiqadi, əməli və əxlaqi deyə üç yerə ayrılsa da əslində bunların hamısı etiqadidir. Belə ki, dini bir hökm hansı qrupda olursa olsun kitab və ya mütavatir sünnə ilə sabitdirsə onun dindən olduğuna, İslami bir hökm olduğuna inanmaq vacibdir. Buna görə də, ayələri və mütəvatir hədislərlə sabit olan bütün dini hökmlər sübut yönündən etiqadi hesab edilir. Misal olaraq adam öldürmənin haram, namaz qılmağın fərz olduğuna inanmaq lazımdır. Bu bir etiqadi hökmdür. Ancaq adam öldürmək və namaz qılmaq əməli bir hadisədir. Bir insan müsəlman birini öldürmənin haram olduğuna

inanmazsa, kafir olur. Ancaq haram olduğuna inanıb da adam öldürərsə günahkar bir mömin olaraq qəbul edilir.

**2. Ağıl ilə verilən hökmlər**

Ağıl, yaradılış məfhumu ilə əlaqəli olaraq üç cür hökm verir: Vücub, imkan, imtina. Buna görə bir şeyin varlığı zəruri isə ona vacib (Allahın varlığı kimi), varlığı ilə yoxluğu eyni olarsa ona mümkün (insanın varlığı kimi), yoxluğu zəruri olarsa da buna Mümtəni (ilahın iki olması kimi) deyilir.

## B. METODLAR

Biz metod mövzusunda söz söyləyənləri 1. Sələfiyyə, 2. Kəlamçılar, 3. Sufiyyə və 4. Fəlsəfəçilər olmaq üzrə dörd qrupda qruplaşdıracağıq.

**1. Sələfiyyə**

Sələf, etiqadi mövzularda ayə və hədislərdəki ilə yetinib bunları olduğu kimi qəbul edən, təşbih və təcsimə düşmədən, təvil etmədən nassda olduğu kimi inananlardır. Hətta onlar bizi təcsim və təşbih fikrinə aparan yəd, vəch, ayn, istiva kimi xəbəri sifətləri olduğu kimi qəbul edirlər. Bunları təvil etməyi, etiqadi mövzularda necə və nə üçün sualını soruşmağı bidət sayırlar. İmam Malikə “Allah Quranda Rəhman ərşə istiva etdi” buyurur, necə istiva etdi?-deyə soruşmuşdurlar. O da belə cavab vermişdir: “İstiva məlumdur. Keyfiyyətini isə ağıl ilə dərk etmək mümkün deyildir. Allahın ərşə istiva etdiyinə inanmaq fərzdir. Haqqında sual soruşmaq isə bidətdir.”

Sələfiyyə öz yolunu Quran yolu olaraq ifadə edir. Belə ki, Quranda dinə dəvətin metodu üç növ olaraq bildirilməkdədir: Hikmət, gözəl nəsihət, ən gözəl şəkildə mücadilə. Bunlardan hikmət və gözəl nəsihət sələf yoludur. Çünki, hikmət, haqqı axtaran yaxşı niyyətli insanlara xeyri və doğru inancı açıqlamaqdır. Haqqı qəbul etdikləri halda nəfsin arzularına əsir olanlara nəsihət etmək lazımdır. Bunların heç birinə sahib olmayan insanlarla da uyğun şəkildə mücadilə edilər.

Sələfiyyənin mütəqəddimi ağılı rədd edir və nəqli yeganə hakim qəbul edirlər. Mütəaxxir sələf alimləri isə etiqadi mövzularda az da olsa ağıla əhəmiyyət vermişdirlər. Misal olaraq, İbn Teymiyyə səhih nəql ilə doğru düşüncənin heç vaxt ziddiyyət yaratmayacağını bildirmiş və bu mövzuda

müstəqil bir əsər qələmə almışdır. Ona görə ağılla nəql bir-birinə zidd isə ya nəql səhih deyildir, ya da ağıl doğru düşünməməkdədir.

Sələf metodu, Qurani-Kərimin qane etmə metoduna uyğun olan və heç bir vaxt ehtimal edilməyəcək bir metoddur. Hər dövrdə xitabət və nəsihətlə döğru yolu tapacaq çoxlu insanlar var olacaqdır. Çünki din sadəcə quru ağla və məntiqə xitab edən bir müəssisə deyildir.

**2. Kəlamçılar**

Kəlam metodunu ilk dəfə Mötəzilə işlətmişdir. Daha sonra sünni kəlamçılar eyni metodu davam etdirmişdirlər. Əvvəllər ağla daha az yer verilərkən mütəəxxirin kəlamçıları dövründə ağla daha çox yer verilmişdir. Bu dövrdə kəlamçıların fəlsəfənin təsirində qaldıqları və “nəzər” adını verdikləri istidlal növünü çox işlətdikləri görünür. Kəlamçılara görə məlumat əldə etmənin üç yolu vardır.

**a. Sağlam duyğu orqanları**

Sağlam duyğu orqanları ilə əldə edilən məlumatlar ağlın doğruluğuna hökm verdiyi zəruri məlumatlardır. Hissiyyat orqanlarının hər biri nə üçün yaradılmış və vəzifələndirilmiş isə onu idrak edir. Misal olaraq eşitmə orqanı ilə səslər, burun orqanı ilə qoxulu şeylər idrak edilir. Səs göz ilə, rəng qulaqla idrak edilməz. Belə ki, Allahu Təala adətullah və sünnətullah deyilən təbii qanunlarını mükəmməl şəkildə yaratmışdır.

**b. Doğru xəbər**

Reallığa uyğun olan xəbər deməkdir. İki qismə ayrılır:

**2. Mütəvatir xəbər**: Yalanla ittifaq etmələri imkansız olan bir topluluğun rəvayət etdiyi xəbərə deyilir. Mütəvatir xəbər zəruri məlumat ifadə edir. Ancaq bu xəbərin zəruri bilgi ifadə etməsi üçün üç şərt lazımdır:

a) Xəbər verilən sağlam duyğu orqanlarının idrak sahəsinə aid olan xüsuslarda olmalıdır.

b) Xəbər verilən xüsus ağıl baxımından imkansız olmamalıdır.

c) Xəbər verənlərin yalan üzərinə birləşmələri mümkün olmamalı və təvatür sayı hər dövrdə qəti bir formada mövcud olmalıdır.

**1. Xəbəri Rəsul**: Peyğəmbərliyi möcizə ilə isbat edilmiş peyğəmbərin verdiyi xəbərdir. Ancaq bu növ xəbər üçün dəlilli məlumat zəruridir.

**c. Ağıl**

Kəlamda insan üçün məlumat əldə etmə yollarının üçüncüsü də ağıldır. Ağıl ilə əldə edilən məlumat ya zəruridir, ya da istidlalidir. Zəruri olana bədihiyyat da deyilir. İstidlali olana kəsbi, iktisabi və nəzəri məlumat da deyilir.

Kəlamçılar nəqli hərəkət nöqtəsi qəbul etməklə bərabər ağla da olduqca çox böyük əhəmiyyət verirlər. Belə ki, ağıl dini mükəlləfiyyət üçün qaçınılmaz bir şərtdir. Ağıldan məhrum olanları din məsul tutmur. Çünki, ağlı olmayanın məsuliyyəti də olmur. Əlavə olaraq ağıl xeyir ilə şəri, gözəl ilə çirkini idrak edir. Ancaq ağıl tək başına hakim deyildir. Müstəqil olaraq dini əqidələri doğru olaraq tapa bilməz, fərz və haram kimi mövzuları təyin edə bilməz.

Din ağlı azmaqdan və yanılmaqdan qoruyur. Ağıl da nəqli dəstəkləyər, nəqlin gətirdiyi əsas və hökmlərin hikmətlərini anlamağa vasitəçi olur. Qurani-Kərimdə bir çox ayə insanları baxmağa və düşünməyə dəvət edir.

Kəlamçılara görə dini metodda ağlın və məntiqin yox edəcəyi heç bir şey yoxdur. Ancaq ağlın dərk edə bilmədiyi şeylər ola bilər. Din bunları təbliğ edir ağıl da bunları mənimsəyir.

**3. Sufiyyə**

Sufilərə görə ağıl və nəql dini məlumatların mənbəyi olmaqla yanaşı, ən ülvi və qüdsi dini bilgilər kəşf və ilhamla əldə edilir. Sufilər günlərcə və hətta aylarca düşünərək və fikirləşərək ayələrin hər kəs tərəfindən bilinən mənalarından başqa məna və məlumatlar əldə etməyə çalışırlar. Nassların zahirləri özlərindəki kəşf və ilham nəticəsində əldə etdikləri məlumatlarla ziddiyyət meydana gətirsə, onları kəşfin ışığı altında təvil edirlər.

Sufilərə görə bəzi Quran ayələrindən (Kəhf 18/65) (Ənfal 8/29) (Bəqərə 2/282) (Ənam 6/125) (Zumər 39/22) (Ənkəbut 29/9) anlaşılan budur: Qul çalışacaq, əmək sərf edəcək, ən mükəmməl şəkildə ibadət edəcək, ehtiras və mənfəət duyğusundan uzaqlaşaraq yaxşı bir zühd həyatı yaşayacaq, bunun nəticəsi olaraq Allah Təala ona ilham və mərifət adı verilən bir bilgi, nur və bir furqan ehsan edəcəkdir. Qul dini həqiqətləri və ilahi sirrləri bu

bilgi vasitəsilə ən gözəl şəkildə dərk edəcəkdir. Əldə edilməsində qulun heç bir təsiri olmadığına görə, bu cür bilgilərə məvhibəyi-ilahiyyə, eltafı-ilahiyyə və vəhbi elm deyilir.

Kəlamçıların çoxu, sufiyyənin həqiqəti əldə etmə yolu olaraq gördükləri kəşf və ilhamı, həqiqətə aparan və çatdıran bir bilgi vasitəsi olaraq qəbul etmirlər. Çünkü, ilham hər kəs tərəfindən işlədilməsi və nəzarət edilməsi mümkün olan bir bilgi yolu deyildir. Əlavə olaraq, kəşf və ilham sahibi olan şəxs xətadan da qorunmamışdır. Bu səbəblə kəlamda sadəcə peyğəmbərlər ilhamı bilgi mənbəyi hesab edilirlər. Qəzzali, Razi və Amidi kimi kəlamçılar kəşf və ilhamla, yəqin və qəti bilgilərin əldə ediləcəyini qəbul edirlər. Qəzzali, “Ehya” və “əl-Münkiz” adlı əsərlərində həqiqi bilgi əldə etmənin yolunun kəşf və ilham olduğunu şiddətlə müdafiə edir.

Kəşf və ilham bir növ ictihada bənzəyir. Belə ki, ictihad sadəcə sahibinə aid isə, kəşf və ilham da ancaq sahibinə aiddir və ictihad kimi zənn ifadə edir.

**4. Fəlsəfəçilər**

İslam tarixində Əməvilərin son illərində ümumi-qədimə adı verilən fəlsəfi elmlər ərəb dilinə tərcümə edilməyə başladı. O dövrdə fəlsəfə ilahiyyat, təbiət, riyaziyyat, məntiq, siyasət və əxlaq elmlərini özündə cəm edirdi. Tərcümə fəaliyyətlərinin ardınca  Kindi, Fərabi və İbn Sina kimi İslam filosoflarının tarix səhnəsinə çıxdığını görürük. Daha sonra Qəzzali fəlsəfəçilərin ilahiyyat və təbiət mövzusundakı fikirlərini təhlil və tənqid etmiş, ondan I əsr sonra isə Əndəlüslü İbn Rüşd Qəzzalinin tənqidlərinə “Təhafütü-təhafüt” adlı əsərində cavab vermişdir.

Əslində fəlsəfə və İslamı yaxşı bilən şəxs nəsslə fəlsəfə arasında tamamilə uyğunluq olduğunu görə bilər. Çünki, hikmət (fəlsəfi qiyas) şəriətlə qardaşdır. Qurani-Kərimdə Allah öz yoluna dəvətin üç şəkli olduğunu bildirmişdir: Hikmət, gözəl nəsihət və cidal (Nəhl 16/125). Bunlardan hikmət fəlsəfəçilərin, nəsihət sələfin, cidal isə kəlamçıların yoludur. Elə isə Quran həm fəlsəfəçilərin, həm sələfin, həm də kəlamçıların metodundan bəhs etməkdədir.

Dini həqiqətlərin ortaya çıxarılması mövzusunda İslam filosoflarının təqib etdiyi metodun müəyyən çatışmamazlıqları vardır. Çünki, din Allahın vəz etdiyi bir qanundur. Qaynağı vəhydir. Dini araşdırmalarda hərəkət

nöqtəsi daima nəqldir. Halbuki bu xüsusda fəlsəfədə hərəkət nöqtəsi ağıldır. Fəlsəfi cərəyanların hər birində o cərəyanı quran şəxsin ağıl ilə verdiyi hökm hakimdir. İslam filosofları da böyük ölçüdə antik Yunan fəlsəfəçilərinin təsirində qalmış, Əflatun və Aristoteli üstad saymışdırlar. Hətta Fərabi bu iki filosof arasında fikir ayrılığının olması təbii olduğuna baxmayaraq onların görüşlərini uzlaşdırmağa çalışmış, bu mövzuda da bir kitab yazmışdır.

Fəlsəfi metodla nəqli hərəkət nöqtəsini qəbul edən dini metod arasındakı fərqi belə xülasə edə bilərik:

b. Dini metod daha sağlamdır. Fəlsəfi metod yalnız fəlsəfi qiyas və bürhana istinad edərkən, dini metod həm vəhyə, həm hissə, həm də ağıla dayanır.

c. Fəlsəfi metod özəl və şəxsi, dini metod isə ümumidir.

d. Filosoflar öz aralarında belə fikir birliyinə gələ bilmədikləri üçün fəlsəfi metodun sonu böhrandır. Dini metodda isə təslimiyyətlə qəlb hüzuruna qovuşmaq mümkündür.

İslam düşüncəsində “Dini həqiqətlər nə ilə anlaşılır?” sualına cavab verməyə çalışan sələf, kəlamçılar, sufilər və fəlsəfəçilərin görüşlərini xülasə etməyə çalışdıq. Bu metodlardan hər hansı birini seçmək asan deyildir. Bu xüsusda ən ideal sözü sufi Əbu Bəkir Varraq söyləmişdir: “Elm mövzusunda kəlamla yetinib, fiqh və təsəvvüfü kənara atan zindiq olar. Təsəvvüflə yetinərək kəlamı və fiqhi tərk edənlər bidətçi olarlar. Fiqhlə yetinərək təsəvvüf və kəlamı tərk edənlər də fasiq olarlar”.